# DUA VƏ TƏVƏSSÜL



Müəllif:
Ayətullah Seyid Həsən Tahiri Xürrəmabadi



Tərcümə edən: Məhəmməd Xəlilov

# DUA VƏ TƏVƏSSÜL

:Müəllif

Ayətullah Seyid Həsən Tahiri Xürrəmabadi

:Çap nəşriyyat

əl–Mustafa (s) Beynəlxalq Tərcümə və Nəşr mərkəzi

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar

# Mündəricat

# DUA VƏ TƏVƏSSÜL

## KİTAB HAQQINDA

Kitabın adı: Dua və təvəssül

Müəllif: Ayətullah Seyid Həsən Tahiri Xürrəmabadi

Tərcüməçi: Məhəmməd Xəlilov

REDAKTOR: Hacı Arzu

KORREKTOR: Məhəmməd Baqir Şükri

NAşIR: Beynəlxalq əl-Mustəfa (s) Akademiyası

ÇAP TARIXI: ٢٠١٠

ÇAP NöVBəSI: Birinci

TIRAJ: ١٠٠٠

ISBN: ٩٧٨-٩٦٤-١٩٥-٠٥٧-٨

:Ünvan

.İran, Qum, Bahar prospekti, Beynəlxalq əl-Mustəfa (s) Akademiyasının nəşriyyatı

TELFAX: ٠٠٩٨ ٢٥١ ٧٧٤٩٨٧٥

İran, Qum, Mühəmməd Əmin prospekti, Elmlər Akademiyasının nəzdi, Beynəlxalq əl-Mustəfa (s) Akademiyasının nəşriyyatı.

TELFAX: ٠٠٩٨ ٢٥١ ٢١٣٣١٠٤

WWW.MIUP.IR , WWW.ESHOP.MIUP.IR

E-MAIL: ADMIN@MIUP.IR, ROOT@MIUP.IR

**NAŞİRDƏN**

Hər hansı bir inkişaf mərhələsini keçdiyi elmi-tədqiqi bir iş ilkin olaraq yazıçının ilham zəmisinə səpdiyi sorğu-suallarla başlayıb, müəyyən zamanda verdiyi səmərəsilə yekunlaşır. Əlbəttə, bu işin sonu yox, yeni-yeni fəaliyyətlər üçün ümid və təşəbbüs deməkdir. Belə ki, əldə olunan hər bir səmərəli qazancın məhsuldarlığı həmişə onun artımı üçün şərait yaradır. Demək, zaman keçdikcə elm, bilik, hünər əhli onun .toxumlarını becərib-yetişdirir, daim elm və mədəniyyətin cərəyanını təmin edir

Fasilə və hüdudları həddən artıq azaldan son müasir zamanımız coşqun tufan kimi, maraqlanan hər şəxsin qarşısına qalaq-qalaq məlumatı sovurub gətirir, mədəniyyətin yeni bir mərhələsinə qapı açır. Hər halda onun normal inkişafında, şübhəsiz, düzgün .təsəvvür və istiqamət həlledici rola malikdir

Beynəlxalq əl-Mustəfa (s) Akademiyası ümumdünyəvi rolu, dini hövzələr arasında xüsusi yeri və yetdik kadr imkanına malik olduğunu nəzərə alaraq, artıq, elmi təhqiqat və tədqiqatlar üçün geniş şərait yaratmağı qarşısına qəti məqsəd qoymuşdur. Bununla əlaqədar

BMA-nın tədqiqat şöbəsi fundamental proqramın təşkili, mövcud avadanlığın düzgün təmini və dini sahələrdə araşdırma aparmaq istəyənlərin cəlb olunmasını özünün ən mühüm vəzifələrindən bilir. Ümid edirik ki, elmi-təhqiqi işlərə qarşı maraq və dirçəlişlərə zəmin yaratmaq və potensial imkanları inkişaf etdirməklə dünyanın hər bir .guşəsində dini mədəniyyətin çiçəklənməsinin şahidi olaq

BEYNəLXALQ əL-MUSTəFA (S) AKADEMIYASı

TəDQIQAT şöBəSI

## MÜNDƏRİCAT

## ÖN SÖZ

Şiə məzhəbindəki inanclar Quranda əks olunmuş və məsum imamlar (ə) tərəfindən şərh edilmiş İslam prinsiplərindən ibarətdir. Şiə alimlərinin Quran və hədislərdən qaynaqlanan əqlə, rəvayətə və təfsirə aid bəhsləri bu inanclara xüsusi bir nizam verir .və maarif xəzinəsini zənginləşdirir

Şübhəsiz, "Tövhid" ilkin şiə inancıdır və bu məktəbdə dərin köklərə malikdir . Şiə məzhəbinin tövhidə aid hədislər toplumunu daha çox mütaliə edən şəxs onlardan daha çox dərs götürəsidir. Tövhid mövzusunda şiələrin birinci imamının (ə) "Nəhcül-bəlağə"dəki xütbələri hamını heyrətə gətirir. Məsum imamlardan (ə) nəql olunmuş "Kumeyl", "Əbu Həmzə Sumali", "Minacati-Şəbaniyyə" və bu kimi digər dualar tövhid bulağından süzülən zülal su, bir olan Allahla düzgün raz-niyazdır. Şiə məzhəbində . "Tövhid" birinci əsasdır və bütün başqa mövzular yeganə Allaha pərəstiş rəngindədir

Bu tövhid təlimləri hər bir şiə fərdə zəruri edir ki, Allahdan qeyrilərindən uzaqlaşıb, şirk çirkabından qorunsun. Amma təəssüflər olsun ki, müsəlman firqələri

arasında əsil-kökü olmayan vəhhabilik şiəliyin tövhid inancına şübhə yaratmışdır. Şəfaət, ziyarət, təvəssül və bu kimi əməllər şirkamiz tanıtdırılmış, əsassız şübhələr müzakirəyə çıxarılmışdır. Şiə alimləri, hətta əhli-sünnə alimlərindən bəzi insaflı və həqiqətpərəst şəxslər bu böhtanları, şübhələri cavablandırmış və bu mövzuda qiymətli əsərlər yaratmışlar. Həmin əsərlərdən biri də bir cildi əlinizdə olan beş cildlik araşdırmadır. Bu beş kitabda Ayətullah Seyid Həsən Tahiri Xürrəmabadi Quran və hədislərdən bəhrələnərək, həmçinin əhli-sünnənin qədim mənbələrindən istifadə :etməklə şiə inanclarını şərh etmişdir. Həmin kitablarla tanış olaq

;"Tövhid və ziyarət"-١

;"Quran təhrif olunmayıb"-٢

;"Dua və təvəssül"-٣

;"Təbərrük və qəbir ziyarəti"-۴

"Şəfaət"-۵

Ümid edirik ki, bu əsərlər şiə əqidəsi ilə tanışlıq üçün xeyirli bir addım olsun, elm və .insaf əhlinə fayda versin

## PEYĞƏMBƏR (S) VƏ ALLAH ÖVLİYALARINDAN (Ə) İSTƏK

Vəhhabilərin iradlarından biri Peyğəmbər (s) və övliyalarından nəsə istənilməsinədir. Biz əvvəlcə dirilərdən istək mövzusunu araşdıracaq, sonra dünyasını dəyişmiş şəxslərdən istək mövzusunu müzakirə edəcəyik.

Əgər biz Peyğəmbər (s) və imamların (ə) dövründə yaşasaydıq onlardan üç növ istəyimiz ola bilərdi:

١-Adi istəklərimizi yerinə yetirsinlər;

٢-Bizim üçün dua etsinlər, Allahdan dünya və axirət xeyri tələb etsinlər;

٣-Bizim üçün fövqəladə bir iş görsünlər. Məsələn, xəstələrimizə dava-dərmansız şəfa versinlər, çox çətin problemlərimizi aradan qaldırsınlar.

Yuxarıdakı istəklərdən bəzilərini dünyasını dəyişmiş şəxslərdən tələb etmək olmaz. Məsələn, ölmüş adama demək olmaz ki, mənim üçün filan işi yerinə yetir. Amma digər iki istəklə peyğəmbərlərin və övliyaların (müqərrəb - Allahın yaxın) ruhlarına müraciət etmək olar. Belə ki, onlardan Allah yanında şəfaət etmələrini, xəstəliyin sağalması üçün vasitə olmalarını, bəzi çətinlikləri aradan qaldırmalarını, bizə dua

etmələrini istəyə bilərik. Əlbəttə, vəhhabilər bu növ istəkləri şirk sayır və onlarla mübarizə aparırlar. Amma vəhhabilər də birinci növ istəklərə irad tutmur və onu qəbul .edirlər

Vəhhabilərin bizim Peyğəmbər (s) və imamlardan (ə) istəyimizə də iradları yoxdur. Çünki Rəsulullahın (s) dövründə camaat o həzrətin (s) hüzuruna gedir, ondan dua :istəyirdilər. Bəzi şərif ayələrdə də bu mövzu təsdiqlənir və buyurulur

۱. خذ من اموالهم صدقه تطهرهم و تزكيهم بها و صل عليهم ان صلاتك سكن لهم

Onların mallarından sədəqə (zəkat) al. Bununla onları pak etmiş və təmizləmiş" olarsan. (Zəkat alan zaman) Onlara dua et. Çünki sənin duan onlar üçün bir (arxayınçılıq, rahatlıqdır." (۱

.۲

. . . . و لو انهم اذ ظلموا انفسهم جاءوك فاستغفروا الله لهم الرسول لوجدوا الله توابا رحيما

Əgər (bu müxaliflər) özlərinə zülm etdikləri (Allahın fərmanlarını ayaqları altına alıb" tapdadıqları) zaman dərhal sənin yanına gəlib Allahdan bağışlanma diləsəydilər və Peyğəmbər də onlar üçün əfv istəsəydi, əlbəttə, Allahın tövbələri qəbul edən və (mərhəmətli olduğunu bilərdilər." (۲

.۳

و اذا قيل لهم تعالوا يستغفر لكم رسول الله لووا رؤوسهم و رأيتهم يصدون و هم مستكبرون

Onlara: "Gəlin Allahın Peyğəmbəri sizə bağışlanma diləsin!"–söyləndiyi zaman (qürur" və istehza ilə) başlarını bulayarlar və onların təkəbbürlə sənin sözlərindən üz



---

.Tövbə" surəsi, ayə ۱۰۳" . [۱] -۱

.Nisa" surəsi, ayə ۶۴" . [۲] -۲

(çevirdiklərini görərsən." (١)

.۴

قالوا يا ابانا استغفر لنا ذنوبنا انا كنا خاطئين. قال سوف استغفر لكم ربى انه هو الغفور الرحيم

"(Yaqubun oğlanları) Dedilər: Ey ata! Bizim üçün Allahdan günahlarımızın bağışlanmasını dilə. Biz, doğrudan da, günahkar olmuşuq."

"Yaqub dedi: Mən Rəbbimdən sizə bağışlanma diləyəcəyəm. O, həqiqətən, bağışlayan və rəhm edəndir!" (٢)

.۵

و لما وقع عليهم الرجز قالوا يا موسى ادع لنا ربك بما عهد عندك لئن كشفت عنا الرجز لنؤمنن لك و لنرسلن معك بنى اسرائيل

"Onlara əzab gəldiyi zaman dedilər: Ey Musa! Səninlə bağladığı əhdə xatir Allahdan bizim üçün istə . Əgər bu bəlanı bizdən götürsə, hökmən sənə iman gətirəcək və İsrail oğullarını səninlə birlikdə göndərəcəyik." (٣)

Yuxarıdakı ayələrdən məlum olur ki, bəziləri peyğəmbərlərin yanına gəlib, onlardan dua istəyirdilər. Bu istək ənənə şəkli almışdı. Əslində həyatda olduqları zaman onlardan dua istənilməsinə irad olmadığı kimi ölümlərindən sonra da onlardan dua istəyinə irad olmamalıdır. Onların ruhu bərzəx aləmində diridir. İstəklərin son növü haqqında nə demək olar? Allah-taala tarix boyu öz peyğəmbərlərindən və övliyalarından bəzilərinə imtiyaz, fövqəladə qüvvə mərhəmət etmişdir. Onların fövqəladə işləri təbii səbəblərə uyğun gəlmirdi. Həzrət Musanın (ə) əsası buna misal ola



---

١- [١]. "Munafiqun" surəsi, ayə ۵.

٢- [٢]. "Yusif" surəsi, ayə ٩٧ və ٩٨.

٣- [٣]. "Əraf" surəsi, ayə ١٣۴.

bilər.. Musa (ə) onu yerə atanda əjdahaya dönürdi. Sözsüz ki, əsanın əjdahaya çevrilməsinin səbəbləri vardı. Allah-taala həzrət Musanın (ə) ixtiyarına vasitələr vermişdi. Həzrət Musadan başqa bunu bilən yox idi. Möcüzə adlanan bu qüvvəyə başqaları malik deyildilər. Amma möcüzə mürtazların xariquladə işlərdən fərqli bir işdir. Möcüzə gerçəkdən xariqüladə hadisədir. Çünki möcüzədə qeyri-təbii və maddi aləmdən kənar bir amilin birbaşa təsiri vardır. Əsanın əjdahaya çevrilməsi həzrət Musaya (ə) məxsus möcüzə idi. Başqaları nə qədər bilikli və güclü olsalar da, Allah-taala müəyyən səbəbləri onların ixtiyarına verməsə, möcüzə göstərə bilməzlər. Həzrət İsanın (ə) xora və anadangəlmə kora şəfa verməsi, ölünü diriltməsi də bu qəbildəndir. Bu işlər möcüzə adlanır və həzrət İsadan (ə) başqa kimsə bu işləri görə :bilməz. Qurani-kərimdə həzrət İsanın (ə) möcüzəsi barədə buyurulur

و أبرئ الاکمه و الابرص و أحیی الموتی باذن الله . . .

Allahın iznilə anadangəlmə korları, cüzam xəstəliyinə tutulanları sağaldar və Allahın" (iznilə ölüləri dirildərəm." (١

İsa (ə) Allahın izn və icazəsi ilə cüzama və anadangəlmə kora şəfa verir, ölünü dirildirdi. Həzrət İsa (ə) bu işlərdə müstəqil deyildi. Allah özü ona belə bir qüvvə vermiş, .səbəblər yaratmışdı

:Qurani-kərimdə (Səba vilayətinin padşahı) Bilqeysin taxtı barədə oxuyuruq

قال عفریت من الجن أنا آتیک به قبل ان تقوم من مقامک . . . .

Cinlərdən olan bir ifrit dedi: Sən yerindən qalxmamış mən onu sənə gətirə bilərəm." Mən bu işi



---

.Ali-İmran" surəsi, ayə ۴۹" . [١] -١

görməyə çox qüvvətli və etibarlıyam. Kitabdan (səma kitabından) xəbəri olan birisi dedi: Mən onu sənə bir göz qırpımında gətirərəm! (Süleyman) Onu (taxtı) yanında hazır durmuş görüncə dedi: Bu, Rəbbimin lütfündən, mərhəmətindəndir. Məni imtahana çəkməyi üçündür ki, görək Ona şükür edəcəyəm, yoxsa nankor olacağam!" (١)

Əgər Allah bəzi insanlara bu qəbil məqamlar və üstünlüklər mərhəmət buyurmuşsa, onlar Allahın izni ilə xəstəyə şəfa verib, ölünü dirildirlərsə, bir şəxsin məsələn İsanın hüzuruna gedib, belə müraciət etməsinin nə eybi var: "Ey İsa! Ey Allahın Rəsulu! Mənim bu xəstəmə şəfa ver, filan xəstəliyə əlac et."

Əlbəttə həkimin, peyğəmbər və məsum imamın (ə) yanına gedib istək tələb edənlər bilməlidirlər ki, bu insanlar xəstəyə və anadangəlmə kora şəfa verməkdə müstəqil deyillər. Allah-taala istər adi, istərsə də xariquladə işlər üçün onlara elə bir qüdrət vermişdir ki, xəstələrə, anadangəlmə korlara şəfa versinlər. Bəli, peyğəmbərlər və məsum imamlar (ə) bu işdə müstəqil deyillər. Bir şəxs onları müstəqil, qüdrət sahibi kimi qəbul etsə, bu şirkdir və biz şiələr də bu əqidəni düzgün saymırıq.

Şiələr məsum imamlara (ə) təvəssül edir, onları vasitəçi seçirlər. Bu o mənada deyil ki, imamları müstəqil qüdrət sahibi sayırlar. Şiə əqidəsinə əsasən, imamlar Allahla bəndələr arasında vasitədirlər. Əgər peyğəmbərlər və məsum imamlar (ə) həyatda olsaydılar, xəstələrin sağalması, anadangəlmə korun görməsi üçün onlara təvəssül etmək nöqsanlı sayılmazdı. Sual olunur: peyğəmbərlər və məsum imamlar (ə) dünyadan getmiş olsalar, onlara təvəssül etməyə icazə verilirmi? Cavab verilə bilər ki, dünyadan gedəndən



---

١- [١]. "Nəml" surəsi, ayə ٣٩ və ٤٠.

sonra onlara təvəssül etməyə icaza verilmir, amma bu iş şirk də sayılmır. Amma vəhhabilər deyirlər ki, bir şəxs dünyadan getmiş peyğəmbər və ya imama təvəssül etsə, bu iş həm caiz deyil, həm də şirk hesab olunur. Bu barədə bir qədər sonra daha .ətraflı danışacağıq

## HƏQİQİ FAİL (İŞİ EDƏN) ALLAHDIR

### İşarə

:Qeyd etdik ki, peyğəmbərdən (s) və saleh bəndələrdən istək üç növdür

Onlara həyatda olduqları vaxt adi istəklərlə müraciət etmək. Peyğəmbər və ilahi-۱ .övliyalardan bu növ istəyin heç bir eybi yoxdur və o şirk sayılmır

Onlardan bizə dua etmələrini istəmək. Bunun da heç bir eybi yoxdur. Çünki belə bir-۲ istək Allah kəlamı və müsəlmanlıq adət-ənənələrinə uyğundur. Ona görə də mömin kişi və qadınlar həmişə Peyğəmbər (s) və imamların (ə) hüzuruna gedib onlardan dua .istəmişlər

Onlardan fövqəladə işlər tələb etmək. Məsələn; onlardan istəyək ki, anadangəlmə-۳ kora şəfa versinlər və ya bir möcüzə göstərsinlər. Dedik ki, bu növün də heç bir eybi yoxdur. Çünki Qurani-kərim açıq-aydın bəyan edir ki, Allah-taala peyğəmbərlərdən və ilahi övliyalardan bəzilərinə müəyyən möcüzələr vermişdir. Onlar bu möcüzə və xariquladə işlərdən ilahi məqsədlərlə istifadə edirdilər. Müsəlman şəxsin Peyğəmbər (s) və məsum imamlardan (ə) bu qəbil istəklərində, xəstə övladına və ya anadangəlmə kora şəfa istəməsində heç bir nöqsan yoxdur. Çünki bütün

səh:۱۷

bu möcüzələr və xariquladə işlər Allaha aid edilir və bütün vasitələri yaradan Odur. Əslində peyğəmbərlərin və imamların öz varlıqları da Allahdandır. Bütün varlıqlar həzrət Haqqın əsərləridir. Biz bu əqidədəyik ki, peyğəmbərlərdən, imamlardan və saleh bəndələrdən istək həqiqətdə Allahın özündən istəkdir. Əgər adi işlərdə bir şəxsdən nəsə istəmək şirk deyilsə, xariquladə iş istəmək də şirk sayılmır. Vəhhabilərdən soruşuruq: Nə üçün xəstənin həkimə müraciətini şirk bilmirsiniz? Bir xəstənin peyğəmbər və ya imamdan şəfa tələb etməsi nə üçün şirk sayılmalıdır? Bu iki ?istəyin fərqi nədir

Biz peyğəmbərlər və imamlara təvəssül ediriksə də, onları müstəqil, iş sahibi (fail) saymırıq. Onlar ilahi feyzə çatmaq üçün vasitədir. Deyirik ki, bizim Allah dərgahında hörmət və etibarımız yoxdur, sizsə Allahın əsis bəndələrisiniz. Allahdan istəyin ki, bizim xəstəmizə və ya anadangəlmə kora şəfa versin. Bu növ istəyin nə eybi var və o hansı ?əsasla şirk sayılmalıdır

## VƏHHABİLƏRİN DƏLİLİ

Birinci dəlil: Vəhhabilər deyirlər: Biz deyirik ki, adi işlərdə başqalarından kömək istəmək caizdir. Ona görə ki, bu iş təkcə Allaha məxsus deyil. Adi istəkləri yerinə yetirmək insanlara da aiddir. Amma qeyri-adi işlər, məsələn, möcüzə göstərmək, ölünü diriltmək və ya kor şəxsin gözlərinə şəfa vermək Allaha aid işdir və Allahdan başqası bunu bacarmaz. Bəli, bacarmayan şəxslərdən qeyri-təbii işlər istəmək şirkdir. Bir .sözlə, Allaha aid işləri bəndədən tələb etməyimiz xoşagəlməz və şirkamizdir

İbni Teymiyyə deyir: "Hər şəxs Peyğəmbər (s) və ya digər saleh bəndələrin qəbri üstə gəlib öz istəkləri ilə müraciət etsə, ondan xəstəliyinə şəfa, borcunun ödənməsi kimi Allahdan qeyrisinə aid olmayan işlərdə kömək istəsə, bu əməl aşkar

şirkdir və ondan tələb olunmalıdır ki, tövbə etsin. Əgər tövbə etsə, əfv olunar və tövbə etməsə öldürülməlidir." (۱)

Ziyarətul-qubur" risaləsində deyir: "Əgər tələb olunan iş Allahdan başqa heç şəxsin" bacarmadığı bir iş olsa, bu işin bəndədən istənilməsi şirkdir və onu istəyən şəxs müşrikdir. Onun şirki mələkləri və bütləri məbud seçən, İsa və anasını iki məbud sayan şəxsin şirki kimidir. İstər diri, istər ölü şəxsdən bağışlanma, düşmənlər üzərində qələbə, xəstəyə şəfa, ailəyə salamatlıq, borcun ödənməsini istəmək bu qəbildəndir. Amma əgər istək bəndənin qüdrəti çatan işlərdəndirsə caizdir. Məxluqdan bir şey istəmək bəzən caiz, bəzən caiz deyil. Caiz istək mömin qardaş üçün dua istənilməsidir."(۲)

Cavab: İbn Teymiyyə və digər vəhhabilərin cavabında deyirik: Əvvəla, ilahi və qeyri-ilahi işlərin əlaməti nədir? İlahi iş Allahdan başqasının bacarmadığı bir işdirmi? Demək, fail (iş görən) və istək tələb olunan şəxsin o işə qüdrəti çatsa, ondan istəmək şirk deyil. Əgər bir işi Allahdan başqası bacarmazsa, onu Allahdan qeyrilərindən istəmək şirkdir. Bu sözlərdən belə başa düşülür ki, İbni Teymiyyə Allahdan qeyrilərinin acizliyini tövhid və şirk əlaməti sayır.

Əslində isə bu iki şeydən (yəni qüdrətli və aciz olmaq) heç biri şirk əlaməti deyil. Çünki acizdən bir şey istəmək, tələbin faydasız olması dəlildir. Failin işdə acizliyi, şirk yox, istək və tələbinin faydasız olması səbəbidir. Şirk, failin (iş görənin) ilahiliyinə inanmaq və onu işin yerinə yetirilməsində ehtiyacsız bilməkdir. İbn Teymiyyənin məqsədi budur ki, Allahdan qeyri şəxsin işi yerinə yetirməyə qüdrəti yoxsa və bu iş Allahın işidirsə, belə bir işi Allahdan



---

۱- [۱] . "Kəşful-irtiyab"dan nəql olunur, səh. ۲۲۸.

۲- [۲] . Həmin mənbədən nəql olunur, səh. ۲۲۹.

başqasından istəmək və tələb etmək Allaha şərik qoşmaqdır. Çünki belə bir şəxs Allaha aid olan işdə Allahdan başqasını Allaha şərik qoşmuşdur. Allahın işini ondan başqasından tələb etmək Allahdan başqasının ilahiliyinə inamı göstərir və bu şirkdir. Cavab: Xəstəyə şəfanı və bu kimi işləri iki şəkildə tələb edə bilərik. Biri budur ki, istəyən şəxs faili (iş görəni) müstəqil və ehtiyacsız bilir. Bu halda istər ölü, istər diri şəxsdən istər adi, istər qeyri-adi işlər istəmək şirki bildirir. Çünki varlığa və işlərin yerinə .yetirilməsinə təsir göstərən şəxsi müstəqil bilirsə, Allaha şərik qoşmuşdur

Digər növ budur ki, insan müraciət etdiyi tərəfin Allahın verdiyi qüdrətlə, onun izn və iradəsi ilə iş gördüyünə inanır. Şübhəsiz ki, bu şirk deyil. Vasitə seçdiyimiz bütün illətlər .və amillər bu qəbildəndir

Düzgün olar ki, belə deyək: İşlərində müstəqil, başqasına ehtiyacı olmayan mövcudun işi ilahidir. Amma işdə başqa bir qüvvəyə ehtiyacılı hər bir mövcudun işi qeyri-ilahidir. Bir iş müstəqil olmadığına görə, asan ya çətin, möcüzə ya qeyri-möcüzə, təbii ya qeyri-təbiiliyindən aslı olmayaraq qeyri-ilahi işdir. Amma Allah öz işlərində müstəqil və zatən varlı olduğuna görə Onun bütün işləri ilahidir. Bu ilahi və qeyri-ilahi işlərin .əlamətidir

Buna əsasən, adi və qeyri-adi işləri Allahdan və ya başqalarından istəmək arasında heç bir fərq yoxdur. Əgər ağız açdığın, kömək istədiyin, yardım istədiyin şəxsi müstəqil və ehtiyacsız bilsən, bu istək şirkdir. Başqa sözlə, Allaha şərik qoşmaqdır. Əgər faili müstəqil və Allahdan ehtiyacsız bilməsən, onu Allaha ehtiyaclı saysan, bu tələb şirk .yox, eynən tövhiddir

Aləmdə mövcud olan təbii və qeyri-təbii faillər, adi və qeyri-adi illətlər, insani və qeyri-insani güclər, möcüzə və qeyri-möcüzə işlər bütünlüklə qeyri-ilahidir. Çünki varlıq

aləmində Allahdan başqa heç bir fail müstəqil, ehtiyacsız, zatən qane deyil. Allahın yerinə yetirdiyi iş səbəb və vasitələrlə gerçəkləşsə belə, ilahi işdir. Əgər insan Allahdan başqasından hər hansı bir iş istəyirsə və onu tam fail, müstəqil sayırsa, bu şirkdir. Amma insan qarşı tərəfə Allahın qüdrət verdiyinə və onun Allaha möhtac olduğuna inanıb ağız açırsa, bu şirk deyil və Allaha aid işi (ilahi işi) Allahdan başqasından istəmək sayılmır. Allah-taala Qurani-kərimdə qeyri-adi işin Allahdan başqasından istənilməsi :mövzusuna toxunur. Məsələn

.۱

قال یا ایها الملؤ ایکم یأتینی بعرشها قبل ان یأتونی مسلمین. قال عفریت من الجن أنا آتیک به قبل ان تقوم من مقامک و انی علیه لقوی أمین. قال الذی عنده علم من الکتاب أنا آتیک به قبل ان یرتد الیک طرفک فلما رآه مستقرا عنده قال هذا من فضل ربی . . . .

Süleyman) dedi: Ey əyanlar! Onlar müti vəziyyətdə (təslim olaraq) yanıma)" gəlməmişdən hansınız onun taxtını mənə gətirə bilər? Cinlərdən olan ifrit dedi: Sən yerindən qalxmamışdan mən onu sənə gətirərəm. Mən bu işi görməyə çox qüvvətli və etibarlıyam! (Amma) Kitabdan (səma kitabından) bir qədər xəbəri olan şəxs dedi: Mən onu sənə gözünü qırpmamışdan qabaq gətirərəm. (Süleyman) onu (taxtı) hazır (durmuş görüb dedi: Bu mənim Rəbbimin lütfündən, mərhəmətindəndir." (۱)

Bu ayədən aydın olur ki, həzrət Süleyman (ə) məclisdə hazır olanlardan fövqəladə bir .iş istəmişdir

Camaatın peyğəmbərlərdən möcüzə və xariquladə iş istəyi həmin növ istəklərdəndir. Bu işlər adi bəşərin



---

.Nəml" surəsi, ayə ۳۸-۴۰" . [۱] -۱

Allahın izn və iradəsi olmadan yerinə yetirə bilməyəcəyi işlərdəndir. Qurani-kərim bu istəklərin bir qismini şirk kimi tanıtdırmamış və onu tələb edəni müşrik saymamışdır. :Buyurulur

. . . . و أوحينا الى موسى اذ أستسقاه قومه ان اضرب بعصاك الحجر . . .

Musanın qövmü (səhrada) su istədiyi zaman ona (Musaya): "Əsanı daşa vur!" –deyə" (vəhy etdik." (١)

Ayədən məlum olur ki, quraqlıq illərində Musanın (ə) qövmü ondan su istədi. Digər bir (ayə "Bəqərə" surəsindədir.(٢)

.٢

و اذ قلتم يـا موسـى لن نصبر على طعـام واحـد فـادع لنـا ربـك يخرج لنا مما تنبت الارض من بقلها و قثائها و فومها و عدسـها و بصلها قال اتستبدلون الذى هو أدنى بالذى هو خير أهبطوا مصرا فان لكم ما سألتم . . . .

Xatırlayın ki) Siz: "Ya Musa! Biz hər gün yediyimiz eyni təamla kifayətlənməyə hazır)" deyilik. Öz Rəbbinə de ki, bizim üçün torpağın bitirdiyi şeylərdən – tərəvəzindən, xiyarından, sarımsağından, mərcisindən və soğanından yetirsin!" – demişdiniz. Musa da (cavabında): "Siz xeyirli şeyləri bu cür alçaq şeylərlə dəyişdirmək istəyirsiniz? (İndi ki belədir, bu səhradan köçüb) Şəhərlərdən birinə gedin. Çünki sizin üçün istədiyiniz (şeylər orada var" –demişdi." (٣)

.Bu ayədə də fövqəladə və qeyri-təbii bir iş istənilməsi bəyan edilir

:Mövzunu belə xülasələşdirə bilərik

Birinci: Peyğəmbər və ilahi övliyalar Allahın verdiyi



---

.Əraf" surəsi, ayə ١۶٠" . [١] -١

.Bəqərə" surəsi, ayə ۵٨" . [٢] -٢

.Bəqərə" surəsi, ayə ۶١" . [٣] -٣

güc və qüdrətlə xariquladə işlərə qadirdirlər. Onlardan bir iş istəmək onların bacarmadığını istəmək deyil. Çünki onlar ilahi güc və qüvvət sayəsində bu işə .qadirdirlər. Lakin ilahi qüdrətə göz yumduqda ona qadir olmurlar

İkinci: Peyğəmbər və ilahi övliyalardan istək budur ki, onlar Allahın dərgahında xəstənin sağalması üçün vasitəçi, şəfaətçi olsunlar. Başqa sözlə, ilahi qüdrət vasitəsilə xəstəyə şəfa verməyə qadirdirlər. Yəni ilahi dərgahda şəfaətçi (vasitə) olmaq və dua .etməklə

.Əgər insan bir iş istəsə, həqiqətdə onun səbəbini, yəni duanı istəmiş olur

Aydın şəkildə desək, Peyğəmbər (s) felin səbəbini (şəfa duasını) yaratmağa qadirdir. Səbəbə (duaya) qüdrəti çatırsa, "müsəbbəb"ə də (şəfaya da) qüdrəti çatır. Biz o həzrətdən (s) bəzən səbəb, bəzən də müsəbbəb istəyirik. Hər iki istəyə o həzrətin (s) qüdrəti var. Əgər o həzrətdən (s) müsəbbəb (şəfa) istəmiş olsaq, həqiqətdə xəstə üçün səbəb adlanan həmin duanı istəmiş oluruq. Əgər bir şəxs peyğəmbər və övliyalardan bir iş istəsə və desə ki, məsələn mənim xəstəmə şəfa verin, bu istək Allah-taalanın Peyğəmbərə (s) verdiyi qüdrətlə həyata keçir. Bu ona bənzəyir ki, biz Rəsulullahdan (s) cənnətdə onunla birlikdə olmağı istəyirik. Bu istək əslində ondan bu iş üçün dua və şəfaət (vasitəçilik) istəməkdir. Bu iş İlahinin izn və iradəsi ilə baş verməlidir. Allahdan istənilir ki, bizə Peyğəmbərlə (s) birlikdə olmaq tövfiqi nəsib etsin. .Xəstəyə şəfa tələb etmək də bu qəbildəndir

Üçüncü: Bu dəlil peyğəmbər və övliyalardan onların ölümündən sonra nəsə istənilməsinə aid deyil. İnsandan Allahdan başqasının qüdrəti çatmayan iş tələb etmək də şirk hesab olunmamalıdır. Əgər belə olsaydı, kora, xəstəyə şəfa verilməsi, ölünün .dirildilməsi kimi istəklər peyğəmbərlərin zamanında da şirk hesab olunmalı idi

İkinci dəlil: Vəhhabilərin ikinci dəlili budur ki, ölülərdən və sizin sözünüzü eşitməyənlərdən istək və tələb yersizdir, eləcə də şirkə səbəb olur. Çünki ölülər nə danışmağa, nə də dirilərin sözünü eşitməyə qadirdirlər. Onların özlərinə, ya başqalarına xeyir vermək və zərər vurmaq gücü yoxdur. Ümumiyyətlə, ölülərin dünya həyatı ilə əlaqələri kəsilib və heç bir işə qadir deyillər. Məhəmməd ibn Əbdül-Vəhhab bu barədə deyir: "Dünya və axirət barədə caiz dua budur ki, səninlə dostluq edən, sənin sözünü eşidən saleh bir şəxsin yanına gedib "mənim üçün dua et" – deyəsən. Həzrət Rəsulullahın (s) səhabələri o həzrət (s) həyatda olduğu zaman ondan dua istəyirdilər. Amma ölümündən sonra heç vaxt belə bir istəkləri olmayıb. Əksinə, o zaman insanlar Rəsulullahın qəbri üstündə durub Allahı çağıran şəxsi inkar edirdilərsə, Rəsulullahın özünü çağıra bilməzdilər." (۱)

Fəthul-məcid" kitabında deyilir: "Ölülərdən nəsə istəmək, yardım diləmək və onlara" diqqət yetirmək şirk növlərindəndir. Meyitin fəaliyyəti dayanmışdır, özü və başqası ".üçün heç bir xeyir və zərərə qadir deyil

Rəfai adlı vəhhabi yazıçı yazır: "Ölümündən sonra Peyğəmbərin duasına üz tutmaq o zaman mümkün olardı ki, həzrət eşidə, danışa, bir iş görə biləydi. Halbuki onun fəaliyyətləri dayanmışdır və heç bir işə qadir deyil. Adəm övladı öləndə üç təsiri qalır: davamlı sədəqə (vəqf və ya həmişə davamlı olan yaxşı bir iş); başqalarının bəhrələndiyi əməl; saleh övladın duası.(۲) Şübhəsiz, bu hədis Rəsulullaha da şamil ".olunur

Demək, Rəsulullahın bu dünya ilə əlaqəsi kəsilmişdir, nə duamızı eşidir, nə də özü .danışır



---

.Kəşful-şubəhat, səh. ۲۸" .[۱]-۱

.Təfsiri İbn Kəsir", ۱-ci cild, səh. ۳۲۳; "Təfsiri Qurt u bi", ۴-cü cild, səh. ۳۲۵" .[۲]-۲

".O deyir: "Ölülərlə dirilər arasında onların görüşünə mane olan bir pərdə var

:Bu iradın cavabında bir neçə nöqtəyə diqqət yetirmək lazım gəlir

Əvvəla, bütün müsəlmanların etiqadı budur ki, ölüm yoxluq deyil, həyatın bərzəxdə davamıdır. Quran ayələrindən bəziləri ölülərlə əlaqənin mümkün olduğunu bildirir. :Məsələn

وسئل من ارسلنا من قبلك من رسلنا أجعلنا من دون الرحمان آلهه يعبدون

:Allah-taala Rəsulullaha (ə) əmr edir

Səndən əvvəl göndərdiyimiz peyğəmbərlərdən soruş: Biz Rəhmandan başqa ibadət" (olunası tanrılarmı müəyyən etmişik?" (١

Keçmiş peyğəmbərlərə sual onlarla əlaqənin mümkünlüyünü göstərir. Bəzi ayələrdə :Allah-taala peyğəmbərlərə salam göndərir. Məsələn

سلام على نوح فى العالمين

(Bütün aləmlər içərisində Nuha salam olsun!" (٢"

سلام على ابراهيم

(İbrahimə salam olsun!" (٣"

سلام على موسى و هارون

(Musaya və Haruna salam olsun!" (۴"

سلام على ال ياسين

(İlyasinə (İlyasa) salam olsun!" (۵"

سلام على المرسلين

(Peyğəmbərlərə salam olsun!" (۶"

---

۱- [۱] . "Zuxruf" surəsi, ayə ۴۵.
۲- [۲] . "Saffat" surəsi, ayə ۷۹.
۳- [۳] . Həmin mənbə, ayə ۱۰۹.
۴- [۴] . Həmin mənbə, ayə ۱۲۰.
۵- [۵] . Həmin mənbə, ayə ۱۳۰.
۶- [۶] . Həmin mənbə, ayə ۱۸۱.

Namazın təşəhhüdündən sonra həzrət Peyğəmbərə (s) salam verməək vacibdir və ona :xitabən deyilir

السلام علیک ایها النبی و رحمه الله و برکاته

".Əssəlamu ələykə əyyuhən-nəbiyyu və rəhmətullahi və bərəkatuh"

Məlumdur ki, peyğəmbərlərə və ya İslam Peyğəmbərinə (s) rəsmyyət xatirinə salam verilmir. Əgər peyğəmbərlə rabitəmiz qırılmış olsaydı, o böyük şəxslərə salamımız .çatmazdı və namazda salam vermək yersiz olardı

## BƏDRDƏ ÖLDÜRÜLƏNLƏRLƏ SÖHBƏT

Səhihi-Buxari", "Sireyi-İbn Hişam"də nəql edirlər: "Peyğəmbər (s) Bədr quyularının" başında dayanıb (Bədr savaşında müşriklərin cəsədlərini Peyğəmbərin (s) əmriylə oraya atmışdılar), quyudakı cəsədlərə xitabən buyurdu: "Siz Rəsulullahın (s) pis qonşuları idiniz. Onu mənzilindən çıxardınız, əleyhinə birləşib müharibə etdiniz. Allahımın mənə vədlərini haqq gördüm." Bir kişi Peyğəmbərə (s) dedi: "Ey Allahın .Rəsulu! Ölənlərə niyə xitab edirsiniz? Onların ki bədənlərində ruh yoxdur

Rəsulullah (s) buyurdu: "And olsun Allaha! Sən onlardan yaxşı eşitmirsən..." (yəni onlar (səndən daha yaxşı eşidirlər)." (١)

İbn Huşam "Sirə" kitabında nəql edir: "Gecəyarı Rəsulullahın (s) səhabələri o həzrətdən belə eşitdilər: "Ey əhli Qəlib (Bədr)! Ey Ütbə! Ey Şeybə! Ey Üməyyə ibn Xələf! Ey Əbu Cəhl ibn Huşam!" Beləcə həzrət Bədr savaşında ölənlərin hamısının adını çəkdi və buyurdu: "Rəbbinizin vədini haqq gördünüzmü?" Müsəlmanlar ərz etdilər: "Ya Rəsulullah! Ölüləri çağırırsan?" Həzrət (s) buyurdu: "Siz dediklərimi onlardan yaxşı .eşitməzsiniz



---

Sireyi İbn Huşam", ٢-ci cild, səh. ٢٩٢; "Səhih Buxari", ۵-ci cild, səh. ٩٨ (azca" . [١] -١ .(ixtilafla nəql olunub

Sadəcə, onlar mənə cavab verə bilmirlər.Onlardan eşitdiyimi, onlara dediyimi siz (eşitmirsiniz. Çünki onlar mənə cavab verməyə qadir deyillər (ki, siz də eşidəsiniz)." (١)

İkincisi, vəhhabilərin özləri də Rəsulullahın (s) diri olduğunu etiraf edirlər. "Rəsailus-sunniyyə"nin ٣-cü risaləsində deyilir: "Bizim etiqadımız budur ki, Rəsulullah qəbirdə diridir. Onun bərzəx həyatı şəhidlərin həyatından daha üstün bir həyatdır. Şəhidlərin diriliyi isə Quranda açıq-aşkar təsdiqlənir. Peyğəmbər, şübhəsiz, şəhidlərdən daha da (fəzilətlidir. Həqiqətən, o, göndərilən salamı eşidir." (٢)

Bu kimi cümlələr həmin kitabın ٥-ci risaləsində də gə müşahidə olunur. Bu cümlələrdə .Rəsulullahın diriliyi və ona göndərilən salamın ünvana çatması etiraf edilir

Sünəni Əbi Davud"da Peyğəmbər (s) qəbrinin ziyarətinə aid hissədə Rəsulullahdan (s)" :nəql olur ki, həzrət (s) buyurur

ما من احد يسلم على الا رد الله على روحى حتى ارد عليه السلام

Hər şəxs mənə salam versə, onun salamına cavab üçün Allah ruhumu mənə" (qaytarır." (٣)

:Bəzi rəvayətlərdə deyilir

ان الله تعالى وكل بقبره ملائكه يبلغونه عن امته السلام

Həqiqətən, Allah-taala ümmətin salamını o həzrətə çatdırmaq üçün onun qəbrinə" (mələklər təyin etmişdir." (٤)

Səmhudi "Vəfaul-vəfa" kitabında bu mövzuda Rəsulullahdan (s) müxtəlif rəvayətlər nəql edir və onların



---

.Həmin mənbə; Sireyi Hələbi, ٢-ci cild, səh. ١٧٩ . [١] -١

.(Kəşful-İrtiyabdan nəql olunub, səh. ١١٠ (Dəməşq çapı . [٢] -٢

Sünəni Əbi Davud", ٢-ci cild, səh. ٢١٨; "Kitabul-mənasik", "Babu ziyraətil-" . [٣] -٣ .qubur"; "Sünəni-Beyhəqi", ٥-ci cild, səh. ٢٤٥

çoxlarının mənbə baxımından düzgünlüyünü qeyd edir: "Alimlərdən bir çoxu bu rəvayətlərin düzgünlüyünə şəhadət vermiş və onları mötəbər saymışlar. O cümlədən, Əhməd ibn Hənbəl, Beyhəqi və müəllif özü, səhih mənbə ilə Rəsulullahdan (s) nəql :edirlər

ان الله ملائکه سیاحین فی الارض یبلغونی من امتی السلام

Allah-taalanın yer üzündə səyahət edən və ümmətdən mənə salam çatdıran" ".mələkləri var

:O deyir: Rəsulullah (s) buyurub

من صلی علی عند قبری سمعته و من صلی علی نائیا بلغته

Hər şəxs mənim qəbrimin yaxınlığında mənə salavat göndərsə, onu eşidirəm. Hər" (şəxs uzaqdan mənə salavat göndərsə, (o da) mənə çatır." (۱

:Yenə də nəql olunmuşdur ki, Rəsulullah (s) buyurub

علمی بعد وفاتی کعلمی فی حیاتی

(Mənim vəfatımdan sonrakı elmim, həyatımda və diriliyimdəki elmim kimidir." (۲"

Yenə də Səmhudi deyir: "Rəsulullahın (s) və sair peyğəmbərlərin vəfatından sonra onların diriliyinə şəkk yoxdur. Onlar diridirlər və qəbirdə şəhidlərin həyatından da daha üstün həyatları var. Allah-taala öz kitabında onların diriliyindən danışır. Bizim (Peyğəmbər (s) isə onların ağasıdır." (۳

O etibarlı və düzgün sənədlərlə Beyhəqidən, İbn Macədən, Süyutidən və Hafiz Əbu Nəim İsfahanidən peyğəmbərlərin ölümdən sonrakı diriliyi barədə bir neçə rəvayət :nəql edir. İbn Abbasdan düzgün sənədlə bir rəvayət



---

.Vəfaul-vəfa", ۴-cü cild, səh. ۱۳۵۰" . [۱] -۱

.Həmin mənbə, səh. ۱۳۵۲ . [۲] -۲

ما من احد يمر بقبره اخيه المؤمن كان عرفه و رد عليه السلام

Hər şəxs mömin qardaşının qəbri yanından keçəndə ona salam versə, həmin mömin" (onu tanıyar və onun salamının cavabını verər." (١

:O Aişədən nəql edir

ما من رجل يزور قبر اخيه فيجلس عنده الا استأنس به حتى يقوم

Hər şəxs öz qardaşının qəbrini ziyarət edib, qəbrin yanında otursa, oradan qalxana" (kimi qardaşı onunla munis (ünsiyyətdə) olar." (٢

(Sonra deyir: "Bu mövzuda rəvayətlər çoxdur." (٣

O Beyhəqidən belə nəql edir: "Düzgün hədislərdə Peyğəmbərin (s) vəfatından sonra (diri olması barədə çox dəlil vardır." (۴

Sonra hədislərdən bir neçəsini zikr edir. Peyğəmbərin (s) qədim peyğəmbərlərlə görüşü nəql olunur. Sonra deyir: "Bu mövzu (peyğəmbərlərlə görüşüb onlar üçün namaz qılmaq) düzgündür. Çünki Allah peyğəmbərlərin ruhunu onların bədənlərinə (qaytarar. Onlar şəhidlər kimi diridirlər." (۵

Sonra deyir: Bir hədisdə Peyğəmbər (s) buyurur: "Cümə günləri mənə çoxlu salavat "...göndərin. Sizin salavatınız mənə çatır

Daha sonra deyir: "İbn Macə mötəbər sənədlərə əsasən –eləcə də Munziri –rəvayət edir ki, Rəsulullah buyurdu: "Cümə günü mənə çoxlu salavat göndərin. O salavatlar müşahidə olunur və mələklərin qarşısındadır. Hər şəxs mənə salavat göndərsə, həmin ".salavat qurtaran an mənə çatar



---

.Həmin mənbə, səh. ١٣۵١ . [١]-١

.Həmin mənbə . [٢]-٢

.Həmin mənbə . [٣]-٣

.Həmin mənbə, səh. ١٣۵٢ . [۴]-۴

Ravi deyir ki, Rəsulullahdan (s) soruşdum: "Öləndən sonra da belədir?" Həzrət (s) buyurdu: "Bəli. Öləndən sonra da salavat mənə çatır. Həqiqətən, Allah-taala (peyğəmbərlərin cəsədlərini yeməyi torpağa haram buyurmuşdur." (١

".Sonra İbn Macə deyir: "Deməmək, Allahın Peyğəmbəri (s) sağdır, ona ruzi verilir

:Yenə də nəql edir ki, Peyğəmbər (s) buyurdu

حیاتی خیر لکم تحدثون و یحدث لکم و وفاتی خیر لکم . . .

Mənim həyatım (diriliyim) sizin üçün xeyirlidir. Siz hədis və hekayələr danışırsınız, mən" də sizin üçün hədis deyirəm (yəni bir-birimizlə danışırıq). Mənim vəfatım da sizin üçün xeyir-bərəkətlidir. Çünki sizin əməlləriniz mənə çatır. Əgər sizin əməllərinizdə xeyir işlər görsəm, buna görə Allaha həmd edərəm. Əgər pis və şər əməllər görsəm, sizin (üçün bağışlanma diləyirəm." (٢

O, ustadı Əbu Mənsur Bağdadidən nəql edir: "Bizim tədqiqatçı səhabələrimiz deyirlər ki, Peyğəmbərimiz Məhəmməd (s) vəfatından sonra diridir. O, ümmətinin ibadətlərinə (görə şad olur. Həqiqətən, peyğəmbərlərin cəsədi çürümür." (٣

Beyhəqi deyir ki, peyğəmbərlərin ölümdən sonrakı həyatının isbatı mövzusunda ayrıca .bir kitab yazmışıq

.O, "Vəfaul-vəfa" kitabında bu barədə çoxlu nəzər və rəvayətlər sübut göstərir

Bu barədə rəvayətlərin nəqlində məqsəd, Peyğəmbərin (s) bu dünya ilə əlaqədə .olmasının, ziyarət və salamlardan xəbərdarlığının sübutudur

İbn Abidin demişdir: "Muxtaratun-nəvazil" kitabında



---

.Həmin mənbə . [١] -١

.Həmin mənbə . [٢] -٢

.Həmin mənbə, səh. ١٣٥۴ . [٣] -٣

nəql olunduğu kimi, qəbir əhli hər həftə ziyarət olunur." "Lubabul-mənasik"in şərhində deyir: "Cümə, şənbə, duşənbə və pəncşənbə günlərində qəbir ziyarəti həftənin digər günlərində ziyarətdən fəzilətlidir." Məhəmməd ibn Vasii demişdir: "Ölülər cümə günü, ondan bir gün qabaq və ondan bir gün sonra öz ziyarətçilərini eşidir və tanıyırlar. (Demək, cümə günü ziyarət daha fəzilətlidir.(١)

Molla Əli Qari "Şərhul-lubab"da deyir: "Ziyarətin qaydalarından biri budur ki, ziyarət edən şəxs ölünü baş tərəfdən yox, ayaqları tərəfdən ziyarət etsin. Çünki ölü ziyarət edənə baxmaq üçün zəhmətə düşür. Əlbəttə, bu qaydaya imkan olanda riayət edilir. " ((٢)

Üçüncüsü, "Fəthul-məcid" kitabında zikr olunmuş iki dəlildən heç biri ölülərdən kömək istəyinin şirk olduğunu isbat etmir. Amma birinci dəlildə deyilir ki, meyitin dünya aləmi ilə rabitəsi tamamilə kəsilmişdir. Əgər bu düzgün olsa, meyitdən istəyin şirk olması .yox, faydasız olması sübuta yetir

:Amma ikinci dəlildə deyilən

لا يملك لنفسه نفعا و لا ضرا

cümləsi də meyitə aid edilmir. Heç bir varlıq - istər insan olsun, istərsə də başqa varlıq - özünə və ya başqasına xeyir və zərər verməkdə müstəqil deyil. Varlıq aləmində hər nə varsa, Allahın izn və iradəsi ilə xeyir və zərər yetirə bilər. İstər diri olsun, istər ölü, .istər insan olsun, istərsə də başqa varlıq. Xeyir və zərərin həqiqi maliki Allahdır

Amma adi halda Allahın izn və iradəsi ilə bir mövcudun başqa birinə təsiri, xeyir və zərər yetirməsi mümkündür. Demək, insan öləndən sonra Allahın izn və iradəsi ilə bərzəxdəki həyatında xeyir və ya zərər verməyə



---

١- [١] . "Rəddul-muxtar ələl-durril-muxtar", ١-ci cild, səh. ٦٠٤.

٢- [٢] . Həmin mənbə, səh. ٦٠٤ və ٦٠٥.

qadirdir. Bunu düzgün saysaq da, ölülərdən istəyin faydasız olması sübuta yetmir və .bu əməli (ölülərdən istəyi) şirk saymağa əsas yoxdur

Demək, ölüm insan həyatının sonu deyil. Ölüm başqa bir həyata və dünyaya köç üçün qapıdır. İnsanın mahiyyəti onun cismi yox, ruhudur. Çünki insanın nəfsi, ruhu əbədi və həmişəlikdir. Demək, insan da əbədi və həmişəlikdir. Əgər insanın bu dünyada Allahın izni ilə xariquladə bir işə qüdərti çatırsa, həmin insan Allahın iradəsi ilə digər bir .dünyada və bərzəx aləmində dua edib, Allahdan xəstəyə şəfa istəyə bilər

Dördüncüsü, Rəfainin ortaya atdığı şübhənin və Rəsulullahdan (s) dəlil gətirdiyi hədisin cavabında deyilməlidir ki, işarə olunmuş rəvayətə əsasən, Rəsulullah (s) bu aləmdə .hər şəxsin yaxından və uzaqdan ona verdiyi salam-salavatı eşidir

Nəsai nəql edir ki, Rəsulullah (s) buyurub: "Hər şəxs mənim vəfatımdan sonra məni ziyarət etsə, mənə salam göndərsə, mən ona on salam deyərəm və onu on mələk ziyarət edib salam söyləyər. Hər şəxs mənə öz evində salam versə, Allah-taala ona ".salam-salavat göndərmək üçün ruhumu mənə qaytarar

Bu və bu zəmində nəql olunmuş digər rəvayətlərə əsasən, Rəsulullah (s) bizim salamımızı eşidir və hər şəxs ona salam versə, salamını alır, ona salam-salavat göndərir. Buna görə də namazın təşəhhüdündə Rəsulullaha (s) salam vermək vacibdir. Bəzi müsəlman fəqihlərin nəzərincə bu salam müstəhəbdir. Aydın olur ki, hər şəxs Rəsulullaha (s) salam-salavat göndərsə, həzrət onu eşidir. Demək, "Rəsulullahın bu aləmlə əlaqəsi həmişəlik kəsilib, bizim dua və sözlərimizi eşitmir" iddiası əhli-sünnənin .mötəbər kitablarındakı hədislərə ziddir

Digər tərəfdən, Rəsulullahdan (s) nəql olunan hədis

insanın bu aləmlə əlaqəsinin tamamilə kəsildiyini bildirmir. Hədisdə insanın savab və cəza verilən əməllərinin dayandığı nəzərdə tutulur. Yəni ölümdən sonra savab və mükafat veriləsi əməl yoxdur. Burada məqsəd Adəm övladının bu dünya ilə əlaqəsinin kəsilməsi deyil. Çünki qeyd olunmuş hədisdəki "inqita" (kəsilmə və dayanma - yəni :əlaqənin kəsilməsi) sözü insanın özünə yox, əməllərinə aid edilir. Həzrət (s) buyurur

اذا مات ابن آدم انقطع عمله

".Adəm övladı öləndə əməli dayanır"

.Bu hədisin məzmunundan aydın olur ki, istisna hallarında əməllərin savabı daimi olur

Başqa təbirlə desək, bu hədisdə həzrət (s) buyurur ki, ölümdən sonra əməllərin savabı dayanır. Bəzi əməllərin savabı isə davamlı olur. Çünki həmin əməllərin özü də ölümdən .sonra davamlıdır

:Üçüncüsü, Allah-taala şəhidlər barədə Quranda buyurur

و لا تحسبن الـذين قتلوا فى سبيل الله امواتا بل احياء عنـد ربهم يرزقون، فرحين بما آتاهم الله من فضـله و يستبشـرون بالـذين لم يلحقوا بهم من خلقهم ألا خوف عليهم و لا هم يحزنون

Allah yolunda öldürülənləri ölü zənn etmə! Xeyr, onlar öz Rəbbinin yanında diri olub" ruzi yeyirlər. Onlar Allahın öz mərhəmətindən bəxş etdiyi nemətə sevinirlər və şaddırlar, arxalarınca gəlib hələ özlərinə çatmamış şəxslərə görə müjdə verirlər ki, (onlar üçün heç bir qorxu yoxdur və qəm-qüssə görməyəcəklər." (۱)

Bu ayə göstərir ki, şəhidlərin ruhu diridir, ruziləri var, sevinirlər, ilahi nemətlərdən istifadə edirlər, onlara mükafat verilir. Deməki, şəhid ruhlarının dünya ilə əlaqəsi



---

.Ali-İmran" surəsi, ayə ۱۶۹ və ۱۷۰" . [۱] -۱

tam kəsilmir. Bu ruhlar onlara qoşulmayıb intizarını çəkdikləri şəxslərə diqqətlidirlər və onlara müjdə verirlər. Demək, bütün insanların dünya ilə əlaqələrinin tam kəsilməsini qəbul etmək olmaz. Əlaqə saxlamaq, dərk etmək, danışmaq imkanı şəhid ruhu kimi ruhlarda mövcuddur. Rəsulullahın (s) və ilahi övliyaların da şəhidlər kimi olması .mümkündür

İkinci şübhə barədə deyirlər ki, ölülərlə dirilər arasında əlaqəni kəsmək üçün pərdə və maneə vardır. Bu iddia qəbul olunmur. Rəvayətlərdən əlavə, şəhidlər barədəki .mübarək ayədə buna cavab verilmişdir

Beşinci nöqtə budur ki, meyitin peyğəmbər və ilahi övliyalar, ya şəhidlər kimi bizim danışığımızı eşidib-eşitməməsinə münasibət zəruri etiqadlardan deyil. Əgər bir şəxs inansa ki, onlar bizim kəlamımızı eşidirlər, səhv etmiş olsa da bu səhv küfr və şirkə səbəb olmayacaq. Əgər ölmüş şəxs həqiqətən istək tələb edən şəxsin sözünü eşitməsə, bu ona bənzəyər ki, kor şəxsdən (onun görməsini güman edib) kitab .oxuması istənilir

Üçüncü dəlil: Vəhhabilərin dua və övliyaların qəbirlərindən kömək istəyinin şirk olmasına göstərdikləri dəlil müşriklərin bütlərdən istəyi barədə nazil olmuş ayələrdir. :Məsələn

و ان المساجد لله فلا تدعوا مع الله احدا

"Şübhəsiz ki, məscidlər Allaha məxsusdur. Allahdan başqa heç şəxsi çağırmayın." (۱)

له دعوه الحق و الذين يدعون من دونه لا يستجيبون لهم بشئ

"Haqq olan dəvət Ona olan dəvətdir. Ondan başqasını çağıranların duası qəbul olmaz." (۲)

ان الذين تدعون من دون الله عباد امثالكم



---

۱- [۱]. "Cinn" surəsi, ayə ۱۸.

"Allahdan başqa çağırdıqlarınız sizin kimi bəndələrdir." (۱)

و الذين تدعون من دونه ما يملكون من قطمير

"Sizin Ondan qeyri ibadət etdikləriniz bir xurma çəyirdəyinin qabığına belə sahib deyillər." (۲)

ان تدعوهم لا يسمعوا دعائكم و لو سمعوا ما استجابوا لكم

"Əgər siz onları çağırsanız, onlar sizin çağırışınızı eşitməzlər, əgər eşitsələr də cavab verəməzlər." (۳)

قل ادعوا الذين زعمتم من دونه فلا يملكون كشف الضر عنكم و لا تحويلا

"De ki, Allahdan başqa Tanrı güman etdiklərinizi çağırın. Onlar sizi nə zərərdən qurtara bilərlər və nə də sizdə dəyişiklik yaratmağa qadir deyillər!" (۴)

ز_ و لا تدع من دون الله ما لا ينفعك و لا يضرك

"Allahdan başqa, sənə nə bir xeyir, nə də zərər verə biləni çağırma." (۵)

و من اضل ممن يدعوا من دون الله من لا يستجيب له الى يوم القيامه

"Allahı qoyub, qiyamətədək cavab verə bilməyən məbudu çağıran kimsədən daha çox haqq yoldan azmış kim ola bilər?!" (۶)

Bu ayələrdə Allahdan qeyrisini çağırmaq pislənir. Deməak, bu ayələr Allahdan qeyrilərindən istək barədədir və müşriklər haqqında nazil olmuşdur.



---

۱- [۱]. "Əraf" surəsi, ayə ۱۹۴.

۲- [۲]. "Fatir" surəsi, ayə ۱۳.

۳- [۳]. Həmin surə, ayə ۱۴.

۴- [۴]. "İsra" surəsi, ayə ۵۶.

۵- [۵]. "Yunus" surəsi, ayə ۱۰۶.

Bu dəlilə cavab olaraq deməliyik ki, əvvəla, bu ayələr müşriklərə aiddir. Onlar məbudlarının ilahiliyinə inanırdılar və Allahdan qeyrilərini icraçı, müdir sayırdılar. Onlar inanırdılar ki, Allah bütün işləri onlara tapşırıb və onlar da bu aləmdə mütləq təsirə malikdirlər. Əlbəttə, onların əqidələri arasında fərqlər də vardı. Bir dəstə ruhlara, bir dəstə mələklərə, başqa bir dəstə bütlərə pərəstiş edirdi. Bu ayələrin müsəlmanların əməllərinə heç bir aidiyyatı yoxdur. Çünki onlar (müsəlmanlar) peyğəmbər və övliyaların ilahiliyinə və allahlığına heç vaxt inanmamışlar. Əksinə, övliyaları Allahın bəndələri bilirlər. Əgər onlardan istəkləri olursa, dua və şəfaət tələb edirlər. Bu da əslində Allahdan istəməkdir. Müsəlmanlar Allahdan qeyrilərinin Allah müqabilində .müstəqilliyinə inanmırlar. Bu müqayisə səhv və insafdan uzaqdır

İkincisi, bu ayələrdə məqsəd yalnız çağırış deyil. Nəzərdə tutulan çağırış ibadət və pərəstiş sayılır. Demək, bu ayələrdəki qadağa (haram olunan) Allahdan qeyrisindən .kömək istəyinə aid deyil. Məqsəd Allahdan qeyrisinə pərəstiş etməyin haramlığıdır

و ان المساجد لله فلا تدعوا مع الله احدا

".Şübhəsiz ki, məscidlər Allaha məxsusdur. Allahdan başqasını çağırmayın"

ادعونی أستجب لکم ان الذین یستکبرون عن عبادتی سیدخلون جهنم داخرین

Məni çağırın, harayınıza yetişim. Mənə ibadət etməyi təkəbbürlərinə sığışdırmayanlar" (cəhənnəmə zəlil olaraq girəcəklər." (۱

Ayənin əvvəlində "dəvət", axırında "ibadət" sözü işlənmişdir. Məlum olur ki, dəvət və çağırışda məqsəd



---

.Ğafir" surəsi, ayə ۶۰" .[۱]-۱

mütləq istək və Allahdan qeyrisini çağırmaq yox, ibadət və pərəstişdir. Hər nida, .Allahdan qeyrilərini çağırış haram olası deyil

İzah: "Dua" lüğətdə "çağırmaq" və "səsləmək" mənasını bildirir. Bu söz Allahla raz-niyaz və Ondan istək mənasını da ifadə edir. Çünki O dünya və axirətin ixtiyar sahibi və malikidir. Demək, dua nida və çağırmaq mənasını bildirsə də, onun ikinci mənası Allahı çağırmaq, qəlbin iştirakı ilə Onunla raz-niyaz etmək və Onun hüzurunda mütilikdir. Bəli, varlıq aləmində ondan başqa müstəqil təsirə malik olan yoxdur. Bu mənada dua .ya lüğət mənasına, ya da ikinci danışıq mənasına əsaslanır

:İkinci mənanın üç əsası var

Çağırılan şəxs çağıran şəxsin inandığı ilahi varlıq, pərvərdigardır. Aləmə və ya .١ dünyanın bir hissəsinə təsir edən və tədbir görən Odur. Necə ki, müşriklər xeyir və şər, .quru və dəniz, ruzi və s. Allahının olmasına inanırdılar

.Onu qəlb iştirakı və zəlilliklə çağırsın, Ondan kömək istəsin .٢

Özünü bəndə, qul, Onu isə özünə ixtiyar sahibi və malik bilsin. Bu xüsusiyyətlərə .٣ malik dua ibadət sayılır. Çünki ibadətdə mötəbər sayılan bu xüsusiyyətlər Allahı çağırışda da mötəbər bilinmişdir. Bu da allahlığına inanılmış varlıq qarşısında bəndəliyi izhar etməklə mütilik və qəlbin iştirakıdır. Demək, hər çağırış, hər səsləmək ibadət deyil. İbadət xüsusiyyətlərinə malik çağırış ibadət sayılır. Peyğəmbərdən (s) nəql :olunur ki, həzrət (s) buyurdu

الدعاء مخ العباده

(Dua ibadətin məğzidir." (١"

:Digər bir rəvayətdə isə həzrət (s) buyurmuşdur

səh:٣٧

---

Termizi bu rəvayəti (٥-ci cild, səh. ۴۵۶-da) nəql etmişdir. "Kəşful-irtiyab", səh. . [١] -١ ..٢٣٣-dən nəqlə əsasən

الدعاء هو العباده

(Dua həmin ibadətdir." (١)"

:Səhifeyi-Səccadiyyə"də imam Zeynəl-Abidin (ə) buyurmuşdur"

فسميت دعائک عباده و ترکه استکبارا و توعدت على ترکه دخول جهنم داخرين

Səni çağırmağı (duanı) ibadət və bunun tərkini təkəbbür adlandırmısan. Onun tərk" (olunması müqabilində cəhənnəmə zəlil halda gəliş vəd etmisən." (٢)

Müsəlmanların, bütün səmavi din ardıcıllarının, hətta müşriklərin dilində dua məhz belə bir mənaya malikdir. Demək, bu ayələrdə qadağan olunan və pislənən iş Allahdan فلا تدعوا مع الله احدا ,qeyrisinə dua, bir şəxsin ilahiliyinə inanmaqla onu çağırmaqdır. Demək fəla tədu məəllahi əhəda" ayəsi bu barədədir. Allahdan qeyrisini çağırmaq, Allahdan" yəni Allahla birlikdə)) "مع الله" .qeyrisinə ibadət etmək olmaz. Bu ayədə bir nöqtə də var "مع الله" .kəlməsi onu göstərir ki, Allahdan qeyrisinə dua Allaha dua kimi olmamalıdır kəlməsi belə duaya aid edilməməlidir. Aydın məsələdir ki, dua və Allahı çağırmaq Ona ibadətdir. Demək, Allahdan başqasına dua Ondan başqasına ibadət olmamalıdır. Əgər bir şəxs məsciddə dua və Allahla raz-niyaz halında bir şəxsi səsləyib ondan su istəsə, şübhəsiz, bu ayə ona aid olmayacaq. Ayədəki qadağa belə bir şəxsə şamil olunmur. Hərçənd ki, kimisə köməyə çağırmışdır. Nəticə budur ki, Peyğəmbərdən (s) və ilahi övliyalardan istək diri bir şəxsdən su istəmək kimidir. Bu istək ibadət hesab edilmir. Çünki peyğəmbərlərdən və ilahi övliyalardan istək Allahın yanında şəfaət diləmək və dua tələb



---

Bu rəvayəti Əhməd (Musnəddə ٤-cü cild, səh. ٢٦٤), Əbu Davud (Sunəndə ٢-ci cild, . [١] -١ səh. ٧٧), Termizi (Sunəndə ٥-ci cild, səh. ٤٥٦) nəql etmişlər. "Kəşful-irtiyab", səh. ٢٣٣- .dən nəqlə əsasən

.Səhif eyi- Səccadiyyə", ٤٥-ci dua" . [٢] -٢

.etməkdən başqa bir şey deyil

Vəhhabilərin peyğəmbərlərdən və ilahi övliyalardan istəyi şirk sayması dəlillərindən .۴ biri budur ki, Allah duanı ibadət adlandırmışdır. Guya ilahi övliyalardan, saleh bəndələrdən, Peyğəmbərdən (s) nəsə istəyən şəxs dua etmiş olur və dua ibadət .sayılır. Deməк, bu şəxs Allahdan başqasına ibadət etməklə Allaha şərik qərar verir

Sənani "Tənzihul-etiqad" kitabında deyir: "Allah öz kəlamında duanı ibadət ".adlandırmışdır

أدعونی أستجب لکم

Hədiyyətul-sunniyyə" kitabında Rəsulullahdan (s) nəql olunmuşdur ki, dua ibadətin" .məğzidir. Başqa bir rəvayətdə də deyilmişdir ki, dua ibadətdir

ayəsini qiraət buyurur. Bu rəvayəti Əhməd, Əbu Davud və "....ادعونی استجب لکم" Sonra .Termizi də nəql etmişdir

Əgər bir şəxs narahatçılıq, çətinlik zamanı Peyğəmbərin (s) ya saleh bəndələrdən birinin adını çağırsa və desə "ya Rəsulullah!", "ey Abbasın oğlu", eləcə də Peyğəmbəri (s) və saleh bəndələrdən birini səsləyib desə "mənim üçün Allahın yanında şəfaətçi ol", "mənim borcumu ödə", "mənim xəstəmə şəfa ver", həmin şəxs Peyğəmbərə (s), saleh bir bəndəyə dua etmiş olur. Dua da ibadət sayılır, ibadətin məğzidir. Demək, o şəxs Allahdan qeyrisinə ibadət etməklə müşrik olur. Çünki tövhid Allahı ilahilikdə vahid (tək) bilməkdir. Yəni təkallahlı insan Allahdan başqasını ruzi verən, xaliq kimi qəbul etmir. Həmçinin tövhid Allahı ibadətdə vahid (tək) qərar vermək, yəni ondan başqasına ibadət etməməkdir. Bütlərə ibadət edənlər müşrik idilər. Eləcə də onlar Allahı ibadətdə ".vahid (tək) qərar vermirdilər

Qeyd olunmuş bəyan iki müqəddimədən, "suğra" və "kubra"dan təşkil olunub. Biri budur ki, Rəsulullahı (s) ya

saleh bir şəxsi çağırmaq, onlardan istək dua etməkdir. Digəri isə hər bir duanın ibadət olmasıdır. Bu qiyasın (müqayisənin) suğra və kubrası vardır. Qeyd olunmuş qiyasın nəticəsi bu olur ki, Allahdan qeyrisini çağıran bir şəxs ona ibadət etmiş və müşrik .olmuşdur

Cavab: Bu qiyas (müqayisə) həm birinci müqəddimə suğra, həm də ikinci müqəddimə kubra cəhətdən səhvdir. Kubra cəhətindən səhvə üçüncü dəlilin cavabında izah verilmişdir. Duanın iki mənası var. Biri çağırmaq, nida etmək, səsləmək mənasında lüğət mənasıdır. Digər məna isə Allahın ilahiliyinə və rəbliyina etiqad, Onun .müqabilində qəlbin iştirakı ilə raz-niyaz mənasında olan danışıqdakı məna, duadır

Duaya rəğbətləndirən hədislərdə dua səsləmək mənasında yox, həmin ikinci mənadadır. Beləliklə qiyasın suğrasında "ya Rəsulullah" çağırışında onun ilahiliyinə və rəbliyina etiqad olmasa, Rəsulullaha (s) dua deyildir. Əgər "ya Rəsulullah!" onun ilahiliyinə və rəbliyina etiqadla birlikdə olsa (nəuzu billah-Allaha pənah aparırıq) bu zaman belə bir nida Rəsulullaha dua və şirk sayılır. Ancaq heç bir müsəlman "ya Rəsulullah!" deyib kömək istədiyi zaman, onun ilahiliyinə etiqadlı olmur. Bu çağırış bir şəxsdən nəsə istəmək üçün onu səsləməyə bənzəyir. Məsələn, boğulan adam fəryad qoparıb, kömək istəyir. Əgər bir şəxs kömək üçün fəryadla "məni suda boğulmaqdan, ya odda yanmaqdan, ya zalımın əlindən qurtarın" desə, onun bu duası ibadət ?mənasındadırmı? O müşrik olmuşdurmu

Bir şəxs suğraya iradı qəbul etməyib desə ki, hər bir çağırış duadır, duanın lüğət mənasını nəzərdə tutsa, ona cavab olaraq deyilməlidir ki, qiyasın kubrası da səhvdir və hər dua ibadət deyil. İbadət məbudun ilahiliyinə və rəbliyina etiqad, pərəstiş mənasından qaynaqlanır. Yəni bir

şəxsin müqabilində söz, ya əməldə onu ilahi və pərvərdigar bilməkdir. Əgər bir şəxsi .səsləyib köməyə çağırsaq, ona pərəstiş etmiş olmuruq

:Səhifeyi-Səccadiyyə"də oxuyuruq"

سميت دعائک عباده

Səni çağırmağı ibadət adlandırıbsan". Bəli, nəinki hər dua və çağırış! Demək, hər bir" çağırış və dua yox, Allahı çağırmaq ibadətdir. Peyğəmbərin (s) hədislərində buyurulur ki, dua ibadətdir, ibadətin məğzidir. Yəni Allahı çağırmaq, Onunla raz-niyaz etmək ibadətdir. Əgər bir şəxsi səsləyib desək ki, "Ya Zeyd! Ya Rəsulullah!" bu dua sayıla .bilməz

İbn Teymiyyə deyir: "Hər şəxs bir peyğəmbər, ya saleh şəxs barədə həddini aşsa, onu bir növ pərvərdigar saysa və desə: "Ey mənim ağam filankəs! Mənə kömək et və mənim dadıma çat", bütün bunlar şirk və azğınlıqdır. Bu sözləri deyən şəxsə tövbə ".etdirilməlidir. Əgər tövbə etməsə öldürülməlidir

Bu söz o zaman düz olar ki, bir şəxs peyğəmbəri və ya qeyri-peyğəmbəri ilahi, məbud, xaliq və müstəqil tədbir sahibi bilsin. Bu şirk və zəlalətdir. Lakin onun ilahiliyinə etiqadı olmasa, bu şirk deyil. Övliyalardan və peyğəmbərlərdən nəsə istəmək, onlara təvəssül etmək onların ilahiliyinə və rəbliyina etiqad deyil. Peyğəmbərlərin və övliyaların qəbirləri kənarında onlara təvəssül edən və onlardan istək tələb edənlər onların ilahiliyinə və rəbliyina etiqadlı deyillər. Əksinə, peyğəmbərləri və övliyaları Allah .yanında vasitə qərar verir, Allahdan istək üçün onlara təvəssül edirlər

## PEYĞƏMBƏRİN (S) VƏFATINDAN SONRA ONDAN İSTƏK

### İşarə

İbn Teymiyyə və onun ardıcılları Peyğəmbər (s) və övliyaların ölümündən sonra onlardan istəyin haram olmasına səhabələrin, onlara tabe olanların və onların ardıcıllarının belə bir iş görmədiyini dəlil göstərmişlər. Onlar səhabənin, onlara tabe olanların yolunu (əməlini) Peyğəmbərin (s) vəfatından sonra üçün örnək qərar vermişlər. İbn Teymiyyə "Ziyarətul-qubur" risaləsində deyir: "Səhabələrin, onlara tabe olanların və onların ardıcıllarının dövründə kimsə peyğəmbərlərin qəbirlərinin yanında dua etməyib, namaz qılmayıb, onlardan bir şey, kömək diləməmişdir. Bu iş nə onlar (şəxsən olmayan yerdə və nə də qəbirlərin yanında baş verib." (١)

İbn Teymiyyə sözünə belə davam edir: "Daha böyük şirklərdən biri budur ki, bir şəxs ölmüş bir adamdan, ya hüzuru olmayan bir şəxsdən kömək istəsin". Sonda deyir: "Nəsranilərin məsih, anası, üləma və rahiblərə münasibəti



---

.Kəşful-irtiyab"dan nəqlə əsasən, səh. ٢٢٨" . [١] -١

belədir. Məlumdur ki, Allah yanında camaatın ən yaxşısı və onların ən əzizi Məhəmməddir (s). Camaatın onun kimi çox biləni səhabələrdir. Onlar o həzrətin həyatı (və ölümündən sonrakı dövrdə belə addım atmamışlar. " (۱

Yenə də İbn Teymiyyə "Ziyarətul-qubur" risaləsində irad tutub deyir: "Peyğəmbərdən (s) və övliyalardan istəyin səbəbi budur ki, Peyğəmbər (s) və saleh bəndələrdən biri dua edib Allahı çağırsa, Allah-taala onların duasına adi adamın duasından daha yaxşı və daha əzəmətli cavab verər. Peyğəmbər (s) səhabələri o həzrətdən dua istədiyi kimi sən də onu çağırıb diri şəxsə dediyin kimi deyirsən: "Mənim üçün dua et!" Sonra deyir: "Bu mətləb (dua və istək) diri şəxs barədə caiz və qanunidir. Lakin peyğəmbərlərin, saleh bəndələrin və bunlardan qeyrilərinin meyitlərindən nəsə istəmək caiz deyil. Onlara "bizim üçün dua et, bizim üçün Allahdan istə", - demək düzgün deyil. Əshabdan və onlara tabe olanlardan heç biri belə etməmişlər. Əbu Hənifə, Əhməd ibn Hənbəl, Malik və Şafei beli bir iş əmr etməmişlər və bu barədə bir hədis də yoxdur. Bizə məlum olan budur ki, müsəlmanlar Ömərin zamanında qıtlıq baş verəndə Peyğəmbərin (s) əmisi Abbasın vasitəsilə su istədilər və dedilər: "Pərvərdigara! Biz sənə nə zaman təvəssül edirdiksə, Peyğəmbərin (s) vasitəsilə bizi sirab edirdin. İndi isə Sənə Peyğəmbərin (s) əmisi vasitəsilə təvəssül edirik. Bizi sirab et." Onlar sudan sirab olurdular və heç vaxt Peyğəmbərin (s) qəbrinə tərəf gəlib demirdilər ki, ya Rəsulullah, bizim üçün dua et, bizim başımıza gələnlərdən sənə şikayət edirik, bizim üçün su tələb et və sair. Peyğəmbər (s) səhabələrindən heç biri belə etməmişlər. Belə bir hərəkət bidətdir. Allah-taala bu əməli təsdiqləyən dəlil nazil etməmişdir. Peyğəmbərin (s) qəbrinin yanına gələnlər salam verər, amma dua etməz, üzlərini qəbirə çevirib Allahı çağırmazdılar. Yalnız qəbirdən



---

.Həmin mənbə .[۱]-۱

.ayrılandan sonra şəriksiz Allahı digər yerlərdə çağırdıqları kimi çağırardılar

Sənani deyir: "Peyğəmbər (s) səhabələri ondan diri olan vaxt dua istəyirdilər. Bu işin caiz olmasında hamının nəzəri birdir." (۱)

:Burada vəhhabilərin sözlərini aşağıdakı kimi xülasə edə bilərik

۱ – Rəsulullahın (s) səhabələrindən, həmçinin onlara tabe olanların və onların ardıcıllarından heç biri peyğəmbərlərin qəbirləri yanında dua etmirdilər.

۲– Peyğəmbərlərin hüzuru olmayan zaman və onların qəbirləri yanında kömək istəmək kimi bir əməl yerinə yetirmirdilər.

۳ – Meyitdən və ya qaib (hüzuru olmayan) şəxsdən kömək istəmək daha böyük şirklərdəndir. Bu nəsranilərin məsihin anasına, alimlərə və zahidlərə (rahiblərə) münasibətdə əməllərindəndir. Lakin Rəsulullahın (s) səhabələri bu işi görməmişlər. Rəsulullahın (ə) həyatı zamanı və vəfatından sonra belə əməl müşahidə edilmir.

۴– Diridən dua istəyi ilə ölüdən dua istəyi arasında fərq var. Peyğəmbər (s) səhabələri onun həyatı zamanında həzrətdən onlara dua etməsini istəyirdilər. Diri şəxsdən dua istəmək caiz və qanunidir. Ölü şəxsdən belə bir istək caiz deyil. Peyğəmbər (s) əshabından heç biri o həzrətin ölümündən sonra belə bir addım atmamışdır.

۵– Meyitdən istək və duanı təsdiqləyən heç bir hədis nəql olunmamış və dörd məzhəb imamlarından heç biri belə göstəriş verməmişlər. Ömərin zamanında kömək istəmək üçün Peyğəmbərin (s) qəbrinə yox, onun əmisi Abbasa müraciət olunmuşdur.

۶– Meyitdən kömək istəmək bidətdir və bunun caiz olmasına heç bir dəlil yoxdur.



---

۱– [۱] . Həmin mənbədən nəqlə əsasən, səh. ۲۳۲.

Rəsulullahın (s) səhabələri o həzrətin qəbrinin yanına gələndə ona təkcə salam-۷
.verərdilər

Rəsulullahın (s) səhabələri dua etmək istəyən zaman heç vaxt o həzrətin qəbri ilə-۸
üzbəüz durmazdılar. Qəbirdən uzaqlaşıb qibləyə üz tutar, başqa yerdə dua etdikləri
.kimi dua edər, Allahı çağırardılar və Ona şərik qərar verməzdilər

Əgər bir şəxs Peyğəmbərin (s) qəbri yanında Allahı çağırmaq istəsəydi, ona irad-۹
.tutardılar. Peyğəmbərin (s) qəbrindən dua və istəkdən söhbət gedə bilməzdi

.İndi isə ayrı-ayrılıqda bu bəndlərə cavab verəcəyik

Birinci və ikinci bəndlərdə qəbirlərin yanında dua etməyin, namaz qılmağın və kömək
:tələb etməyin tərk olunmasında səhabələrə istinad edildi. Bu bəndləri cavablandırırıq

Birinci: Bu müddəanı isbat etmək çox çətin, bəlkə də qeyri-mümkündür. Çünki İbn Teymiyyə və onun kimiləri səhabələrdən yüz illər sonra onların əməl və rəftarları dəlil göstərirlər. Səhabələrin və onlara tabe olanların bütün həyatından agah şəxs varmı ki, onların belə bir iş görmədiyinə şəhadət versin? Deyirlər ki, inkar olunan mövzuya şəhadət qəbul deyil. Yəni bir şəxs şəhadət versə ki, filankəs heç vaxt namaz qılmayıb və ya heç vaxt oruc tutmayıb, bu növ şəhadətlər qəbul deyil. Çünki adi halda bir işin baş verməməsindən agah olmaq mümkün deyil. Necə iddia edirlər ki, səhabələr, onlara tabe olanlar və onların ardıcıllarından heç biri, heç vaxt peyğəmbərin qəbri və ya digər qəbirlərin yanında dua etməyib və namaz qılmayıblar? Axı iddia edənləri Peyğəmbər (s) səhabələrindən və ya onlara tabe olanlardan çox uzun zaman fasiləsi ayırır. Xüsusilə Peyğəmbərdən (s) dua və kömək istəmək kimi mövzulara necə şəhadət vermək olar?!. Adətən, bu cür işlər aşkarda və uca səslə yerinə yetirilmir,
.məxfi və camaatın gözündən uzaqda olur

Bu rəyləri və əqidələri səhnəyə gətirən İbn Teymiyyədir. Bu şəxs hicri-qəməri ٧-٨ əsrlərdə yaşamışdır. Məhəmməd ibn Əbdül-Vəhhab da Rəsulullahın (s) səhabələrindan ١٠٠٠ il sonra yaşamışdır. Onlar necə iddia edə bilərlər ki, Rəsulullahın (s) səhabələrinin bütün hal (vəziyyət) və əməllərindən xəbərləri var? Bütün bunlar .cəfəngiyyat və dəlilsiz iddiadan başqa bir şey deyil

Bu iraddan belə bir şübhə yarana bilər: əgər səhabə və onlara tabe olanların əməllərini inkar etmək mümkün deyilsə, bunların baş verməsini də isbat etmək olmaz. Cavab olaraq deyilir ki, biz hələlik bu əməllərin Rəsulullahın (s) səhabələrindən baş verməsini isbat etmək istəyində deyilik. Sadəcə, səhabələrə və onlara tabe olanlara istinad edənlərin cavabını veririk. Səhabələrin bu əməlləri tərk etməsi mümkün deyil və bu əməllərin tərk edilməsinin isbat olunmaması vəhhabilərin istinad etdiyi dəlilin rəddi .üçün kifayətdir

İrad: Əgər əshab və onlara tabe olanlar qəbirlərin yanında dua etsəydilər və kömək istəsəydilər, bu mətləb bizim üçün nəql olunardı. Nəql olunmamışsa, demək, bu cür əməllər yerinə yetirilməmişdir və bu səhabələrin onları tərk etməsini əməli şəkildə .sübut edir

Cavab budur ki, bu mövzunun nəql olunmaması onun inkar edilməsinə dəlil deyil. Çünki səhabələrin bir çox işləri bizim üçün məxfi qalmış və nəql olunmamışdır. Bizimlə onlar arasındakı uzun zaman fasiləsində bu cür təfərrüatlar nəql olunmayıb. Bundan əlavə, kitablarda peyğəmbərlərin qəbrindən kömək istəmək barədə çoxlu rəvayətlər nəql .olunmuşdur

İkinci: Fərz edək ki, səhabələr Peyğəmbərin (s) qəbri və sair qəbirlərdən kömək istəməmişlər. Səhabənin bir əməli tərk etməsi onun bidət olmasına dəlildirmi? Mümkündür ki, səhabə mübah, ya müstəhəb əməllərdən bir çoxunu tərk etmişdir. Peyğəmbərin (s) bir əməli tərk etməsi o əməlin

haram olmasına dəlildirmi? Belə bir əməl məkruh, ya mubah ola bilər. Peyğəmbər (s) müstəhəb bir əməli də tərk edə bilər. Əməllərin davamlı şəkildə tərk olunması onun haram olmasına dəlil deyil. Əlbəttə, məsumun bir əməli davamlı şəkildə tərk etməsi başqaları üçün höccətdir. Məsələn, Peyğəmbərin (s) bir əməli tərk etməsi bu işin üstün və müstəhəb olmamasına dəlildir. Lakin həmin əməlin haram olması üçün bu hal dəlil olmayacaq. Bundan əlavə, Rəsulullahın (s) səhabələrinin sözü və işi şəri dəlil deyil. Təkcə məsumun sözü və əməli şəri dəlildir. Bəli, əgər səhabənin əməli məsumun razılığını bildirərsə, dəlil sayılar. Ancaq bir əməl və sözün tərki məsumun hüzurunda da olsa, onun haram olmasına dəlil deyil. Səhabələrin zamanında bir çox mövzular mövcud deyildi. Məsələn, maşın və təyyarəyə minmək, bir çox yeməklər və dərmanlar, telefon aparatı, teleqraf, simsiz telefon, radio və televizor. Əgər Peyğəmbər (s) səhabələrinin tərk etdiyi işlər bidət və haramdırsa, bugünkü ixtiralar və texnologiyalar da bidət sayılmalıdır.

Vəhhabilərin son dövrlərdə "Cəmiyyətul-ixvan", ya "Cəmiyyətul-amirinə bil-məruf vən-nahinə ənil-munkər" adlı cəmiyyəti yaranmışdı. Onlar çox təəssübkeş və sərt idilər. İbn Səud telefon xətti şəbəkəsini ölkənin müxtəlif nöqtələrinə genişləndirmək istəyirdi. Lakin tezliklə bu fikirdən daşındı. Çünki telefon xətlərinin çəkilişi "İxvan" cəmiyyətini qiyama qaldıra bilərdi. Sonralar bu iş həyata keçdi. Həmin cəmiyyət telefon xətlərini qırır, bu işi münkir - pis iş sayırdı. Onlar hətta şahzadənin sarayının telefon xəttini qırmışdılar.

Buna görə də sultan Əbdül-Əziz onlara təslim olub, telefon xətlərinin Mədinəyə çəkilməsinin qarşısı alındı. Riyazda və bəzi böyük şəhərlərdə simsiz aparatlar qurulması planlaşdırılanda "İxvan" cəmiyyətindən bir dəstəsi İbn Səudun yanına gedib, ona etiraz etdi.(۱)



---

۱- [۱]. "Cəzirətul-ərəb fil-qərnil-işrin", səh. ۳۰۸.

Həmçinin Nəcddə ilk dəfə əqrəbli saat görəndə onu sındırdılar və şeyxlərə ondan istifadə etməyə icazə vermədilər. Dedilər ki, belə bir şeydən istifadə etmək ən azı (bidətdir.(١

Vəhhabilər avtomobilə də qəzəblə baxır, deyirdilər ki, kafirlərin kəşfidir. Onlar Nəcd .bazarında bir neçə maşın yandırmışdılar

Hicri-qəməri ١٣٤٩-cu ildə Nəcd üləması Məkkədə toplaşıb fəryad qopardı. Bir-birləri ilə məsləhətləşib Məkkədə maarif idarəsinin qarşısında bir qərar çıxardılar. Səbəb bu idi ki, maarif idarəsi məktəblərin tədris proqramına rəsmxətt, xarici dil və coğrafiya dərsləri salmışdı. Coğrafiya dərsində də yerin fırlanması və kürə şəklində olmasından (bəhs olunurdu.(٢

## ?HALALLIQ, YOXSA HARAMLIQ SÜBUTA YETMƏLİDİR

Üsul kitablarında əsas mövzulardan biri budur ki, şəriətdə nəss (rəvayət) və dəlil olmayan mövzularda haram, yoxsa halal əsas götürülməlidir? Bunu iki şəkildə təhlil etmək olar: Allah bir mövzuda beş hökmdən - haram, vacib, müstəhəb, məkruh və mübahdan - bir hökmü buyurmayıbsa, o haramdır, yoxsa halal? Allah bəzi mövzularda heç bir hökm bəyan etməmişdir. Nə vacib və haram kimi qəti hökmlər, nə də müstəhəb, məkruh və mübah kimi qeyri-qəti hökmlər. Bu növ mövzularda biz ağlın hökmünə əsasən qadağaya, yoxsa halallığa önəm verməliyik? Üsulda bu mövzunu "Mübah və həzər (qadağa)" başlığı altında müzakirə etmişlər. Ağıl nə hökm versə, o həqiqi hökmdür. Çünki zahiri hökm o zaman



---

.Həmin mənbə, səh. ٣٠٩ . [١]-١

.Cəzirətul-ərəb fil-qərnil-işrin", səh. ١٥٠" . [٢]-٢

yaranır ki, həqiqi hökmdə şəkk etmiş olaq. Hazırda fərz edirik ki, həqiqi hökmdə .şəkkimiz yoxdur və bu mövzu hökmü olmayan bir mövzudur

Digər təhlil növü budur ki, həqiqi hökmü bizə çatmayan və şəri nəss, dəlili olmayan işlərin ilkin hökmü haram və qadağadırsa, ehtiyat etməliyikmi? Yoxsa onun əsli mübah və caizdir? Şübhəsiz, burada məqsəd əqli və şəri hökmdür. Yəni movzu hər iki cəhətdən araşdırılmalıdır. Bu barədə şəri və əqli hökm olsa, zahiri bir hökmdür. Aydın məsələdir ki, zahiri hökmün mövzusu həqiqi hökmdə şəkdir. Zahiri hökm həqiqətə .tətbiq oluna da bilər, olunmaya da

Birinci plan müzakirə olunası məsələ deyil. Kitab və sünnəyə əsasən, heç bir mövzu həqiqi hökmsüz deyil. Hər bir mövzu, hətta yeni mövzular ümumi və mütləq şəkildə bəyan olunmuş hökmlərlə aydınlaşa bilər. Müctehid onun şəri hökmünü tapmaq üçün tədqiqat aparmalıdır. Əgər hökmdə şəkk etsə, ikinci təhlilə üz tutmalıdır. Xülasə şəkildə deməliyik ki, qadağa üçün bəyan olunmuş dəlillər tamam deyilsə belə bir mövzu əqli cəhətdən - istər şəriətdən qabaq, istər şəriətsiz - "mübah"dır. Müzakirə olunan bəhsin başqa bir növü həqiqi hökmü tapmayan zaman zahiri hökmü araşdırmaqdır. Burada işarə etməliyik ki, şiə və Əhli-beyt (ə) ardıcıllarının nəzərincə, hökmün əsli caiz və mübahdır. Buna kitab və sünnətdən şəri dəlillər gətirilmişdir. Əqli cəhətdən də belə bir əməlin baş verməsinə görə cəza yoxdur. Demək, əgər bir şey barədə səhabənin əməli isbat olunmursa, onun isbatı və inkarı üçün başqa bir dəlilimiz də yoxdursa, deyə bilmərik ki, həmin şey haramdır. Qeyd olunmuş əslə əsasən, onu mübah, halal saymalıyıq. Səhabənin əməl etməməsi, onların bu əməli tərk etməsi bu .əməlin haram olmasına dəlil deyil

Vəhhabilərlə sair İslam firqələri arasındakı mühüm fərqlərdən biri budur ki, başqa firqələr mövzunun haram

olması üçün kitab (Quran) və sünnətdə (hədisdən) dəlil tapmayanda onu halal və mübah bilirlər. Buna görə də yeni mövzuları, təzə kəşflərdən istifadəni, Peyğəmbər (s) zamanında mövcud olmayan şeyləri, mübah bilirlər. Lakin vəhhabilər eyni şəraitdə mövzunu haram sayır, nəss (hədis) və dəlili olmayan, Rəsulullahın (s) və səhabələrin .zamanında görünməmiş işləri haram bilirlər

Üçüncü: Əgər bütün bu müqəddimələri, səhabələrin əməl etməməsini, qəbirlərin yanında kömək diləmək və dua etməyin haramlığını qəbul etsək, bunların şirk və küfr ?ilə nə əlaqəsi

Dördüncü: Tarixə və hədis kitablarına müraciət etdikdə səhabələrin, onlara tabe olanların və onların ardıcıllarının əməllərini vəhhabilərin dediyindən fərqli görürük. Nümunə üçün Səmhudinin (Şafei alimlərindən birinin "Vəfaul-vəfa biəxbari daril-:Mustəfa" kitabında) bəzi qeydlərinə işarə olunur

Ömərin xilafəti zamanında quraqlıq ili oldu. Bir kişi Peyğəmbərin (s) qəbri kənarına-١ gəldi və dedi: "Ya Rəsulullah! Öz ümmətin üçün dua et və yağış istə. Çünki onlar həlak olurlar." Peyğəmbər (s) yuxuda həmin kişiyə buyurdu: "Ömərin yanına get, ona salam ".çatdır və xəbər ver ki, hamınız sirab olacaqsınız

Sonra Səmhudi deyir: "Bu xəbər onu göstərir ki, bərzəx aləmində olan Peyğəmbərdən (s) dua istəmək olar və bu işdə heç bir irad yoxdur. Çünki o insanların istəyindən (agahdır. Deməç, həyatda olduğu kimi ondan sirab olmaq və dua istəmək olar." (١

Səmhudi Hafiz Əbu Əbdillah Məhəmməd ibn Musa ibn Əl-Numandan İmam Əli ibn-٢ Əbi Talibə (ə) çatan sənədlə nəql edir ki, Peyğəmbərin (s) dəfnindən üç gün keçmiş Mədinəyə bir ərəb gəldi. O, Peyğəmbərin (s) qəbrinin torpağını başına töküb



---

.Vəfaul-vəfa", ٤-cü cild, səh. ١٣٧٤" . [١] -١

dedi: "Ey Rəsulullah! Dedin və eşitdim sənin sözünü, səndən qəbul etdiyimizi, Allahdan təhvil aldığını, sənə nazil olanı. O bu ayədir: "Özlərinə zülm edənlər sənin yanına gələr və Allahdan bağışlanmaq tələb edərlər. Sən də onlar üçün bağışlanma dilə, Allahı bağışlayan görərsən." Mən özüm özümə zülm etmişəm. Mənim üçün bağışlanma tələb (edəsən deyə yanına gəlmişəm." (١

Vəfaul-vəfa" kitabının müəllifi ٨-ci babın sonunda Peyğəmbərin (s) qəbrindən istək" barədə çoxlu hədis nəql edir. Bütün bunlar onu göstərir ki, Rəsulullahın (s) qəbrindən kömək diləmək, dua istəmək müsəlmanların daimi ənənəsi olub. O deyir: İmam Məhəmməd ibn Musa ibn Numan bu mövzu barədə "Misbahuz-zəlam fil-mustəğiysin (bi xəyril-ənam" adında bir kitab yazmışdır.(٢

Nəql olunan bu hadisələrə bir neçə münasibət ola bilər. Onların ya hamısı həqiqidir, ya bir qismi. Ya Rəsulullahın (s) qəbrindən kömək istəməyin əsli var, ya istəklərin qəbul olması qeyri-həqiqidir, ya da istəklərdən bəzisi qəbul olmuş, bəzisi rədd edilmişdir. Hər .halda kömək diləmək, istəyin əsli bütün hallarda sabitdir

Digər ehtimal budur ki, bütün nəql olunanlar yalan və qeyri-həqiqidir. Nə istək tələb olunub, nə də onların istəkləri həyata keçmişdir. Beləliklə, bütün bu fərziyyələr və ehtimallardan aydın olur ki, Peyğəmbərdən (s) kömək istəmək və istək tələb etmək geniş yayılmış bir əməl olmuşdur. Birinci, ikinci, üçüncü və dördüncü ehtimalın düzgünlüyü aydındır. Çünki Peyğəmbərdən (s) kömək və dua istəməyin əsli mövcud olmuşdur. Bu nümunələrin ya hamısı, ya da bir hissəsi həqiqətdir. Əgər bu iş pis və .qeyri-şəri bir iş idisə, müsəlmanlar ondan çəkinərdilər

Beşinci ehtimal bütün bu rəvayətlərin qeyri-həqiqi



---

.Həmin mənbə . [١] -١

.Həmin mənbə, səh. ١٣٧٩ və ١٣٨٧ . [٢] -٢

olmasından ibarət idi. Məlum olur ki, bu əməl şirk və küfrə, haram və bidətə səbəb olmaz. Çünki saxta və yalan hədis qoşanlar onları camaatın gözündən salan şirk və küfr nəql etməzlər. Onlar müsəlmanların nəzərində bidət, qeyri-şəri olan əməllərə istinad etməzlər. Məsələn, "xəstəlik, çətinlik, aclıq zamanı Peyğəmbərə (s) təvəssil etdim və Peyğəmbər (s) mənim istəklərimi yerinə yetirdi" - deməzlər. Çünki belə bir hekayə onu nəql edənin şirk və bidətini isbat edir. Heç bir şəxs onun şirk və küfrünü isbat edən dastan nəql etməz. Demək, hekayə saxtalaşdıranlar hər vasitə ilə özlərini Rəsulullaha (s) yaxın göstərmək istədiklərindən küfr və şirk nəql etməz, camaatın .hörmətini qazanmağa çalışarlar

Üçüncü əməl, yəni meyitdən kömək istəməyin mahiyyətinə aid bəhslərdən aydın olur ki, bu əməldə heç bir şirk yoxdur. Nə rübubiyyətdə şirk var, nə ilahiyyətdə, nə də ibadətdə. Bu əməlin ən böyük şirk sayılması isə tam cəfəngiyyatdır.. Bütə səcdə edən və onu öz allahı güman edən şəxsin şirki Peyğəmbərin (s) vəfatından sonra ondan dua !?istəyən şəxsin şirkindən kiçikdirmi

Dördüncü müddəada deyilir ki, diri şəxsdən dua istəməklə ölmüş şəxsdən dua istəmək arasında fərq var. Bu baxışa bəhsin əvvəlində irad tutuldu və cavab verildi. Çünki bərzəx həyatına etiqad, vəhhabilərin Peyğəmbərin (s) ölümdən sonra kamil həyata .malik olmasına, o həzrətin (s) salamları almasına inamı bu suallara heç bir yer qoymur

Beşinci və altıncı müddəa ilə bağlı heç bir hədis deyilməmişdir. "Bu bidətdir" deyənlərə cavab verilir ki, əgər vacib və ya müstəhəb bir işi isbat etmək istəyiriksə, onun şəri dəlilini kitabdan və sünnətdən tapmalıyıq. Biz şəri dəlilsiz hər hansı əməli vacib və ya müstəhəb saya bilmərik. Belə bir yanaşma dində bidətdir. Yəni dində olmayan bir işi dəlilsiz dinin bir hissəsi qərar vermiş oluruq. Amma əgər mübah bir işi, yəni qadağan olunması barədə dəlili bizə çatmayan bir

şeyi yerinə yetirmək istəsək, onun mübahlığını isbat etmək üçün dəlilə ehtiyac yoxdur. Qadağa və haram barədə dəlilin olmaması kifayətdir. Bir əməlin caiz və halal sayılması üçün dəlilə ehtiyac yoxdur. Əgər deyilsə ki, Peyğəmbərin (s), yaxud ilahi övliyaların vəfatından sonra onlardan yardım istəməyin eybi yoxdur və mübahdır, bu sözlər dində bidət hesab olunmur. Çünki belə hallarda ilk qərar mübahlıqdır. Mübahlığın əslinin isbatı üçün kitab və sünnətdə şəri dəlil gəlmişdir. Amma harama dəlilimiz olmayan yerdə əsl haram, ya ehtiyat olarsa, mübahı ilk qərar götürüb deyə bilmərik ki, şərən mübahdır. Bu ümumi və üsuli bəhsdə belə bir nəticəyə gəlirik ki, əsl mübahdır. Buna görə də haramlığına dəlilimiz olmayan mövzunu mübah sayırıq. Bu yanaşma dində .bidət deyil

İkincisi, peyğəmbərlərin, saleh bəndələrin qəbirlərinin yanında və müqəddəs məkanlarda duanın, namazın, Allahı çağırmağın şərən düzgün olmasını isbat etmək üçün Quran və hədislərdə ümumi şəkildə bu əməllərə dəvət olunması bəs edir. ,Məsələn

أدعونی أستجب لكم

".Çağırın Mən,i sizə cavab verim"

أدعوا ربكم تضرعا و خفيه . . . .

(Rəbbinizə yalvara-yalvara, həm də gizlincə dua edin." (١"

:Tanınmış nəbəvi hədisi yada salırıq

الدعاء مخ العباده

".Dua ibadətin məğzidir"

Çünki bu hər bir məkan və zamanda namaz qılmaq və dua etmək nəzərdə tutulur. Bu hədislərdə məkan və zamanla bağlı şərt yoxdur. Bu məkanlar Peyğəmbərin (s), sair peyğəmbər və ilahi övliyaların qəbrinin yaxınlığıdır. Buna

.barədə heç bir qeyd yoxdur, bu iş qadağan olunmayıb

Üçüncüsü, Peyğəmbərin (s) hərəmində dua məsələsidir. Burada Maliki firqəsinin imamı və əhli-sünnədən olan dörd məzhəbin qəbul etdiyi Malik ibn Ənəsin sözlərinə diqqət yetirmək lazım gəlir. Bir gün Peyğəmbərin (s) qəbri kənarında dayanmış Malikdən abbasi xəlifəsi Əbu Cəfər Mənsur Dəvaniqi soruşur: "Üzüqibləyə durub dua edim, "?yoxsa Rəsulullahın (s) qəbrinə tərəf

Malik ona deyir: "Nə üçün üzünü o Həzrətin (s) qəbrindən çevirəsən? Axı o sənin və atan Adəmin qiyamətdəki vasitəsidir? Üzünü qəbrə çevir və onu şəfaətçi (vasitə) qərar (ver!" (١

:Bu söhbətdən bir neçə nöqtə aydınlaşır

Peyğəmbərin (s) qəbri yanında dua Peyğəmbər (s) səhabələrinə tabe olan əhli--١ .sünnə imamı Malik kimi şəxsin əməlidir

Mədinə və müsəlman alimlərindən heç biri ondan bu sözü inkar etməsini tələb-٢ etmədilər və onu qınamadılar. Əgər Mədinə əhli inkar etsəydi, hökmən tarixdə qeydə .alınardı. Məzhəblər arasındakı ixtilaf belə məsələləpi kölgədə qoymur

Peyğəmbərin (s) vəfatından sonra şəfaətçi seçmək və təvəssül etmək əməli Malik-٣ :ibn Ənəs kimi şəxsdə müşahidə olunur. Malik xəlifə Mənsura açıq-aşkar deyir

استشفع به

".Onu şəfaətçi qərar ver və ona təvəssül et"

Malik deyir: "O sənin və atan Adəmin qiyamətdəki vasitəçinizdir." Bu söz Quran-۴ :ayəsinə işarədir

یا ایها الذین آمنوا أتقوا الله وبتغوا الیه الوسیله . . .

Ey iman gətirənlər! Allahdan qorxun. Ona tərəf"

۱- [۱] . "Səblul-Huda vər-rəşad", ۱۱-ci cild, səh. ۴۳۹; Vəfaul-vəfa, ۴-cü cild, səh. ۱۳۷۶.

(yaxınlaşmaq üçün (sizi ona yaxınlaşdıran) bir vasitə tələb edin." (١)

Bu söhbətdən aydın olur ki, Rəsulullahın (s) vəfatından sonra ona hörmət sağlığında-٥ hörmət kimidir. Çünki Malik başa salır ki, bura Rəsulullahın (s) hərəmidir və səsini :yavaş çıxarmalısan. Sonra bu ayəni oxuyur

. . . . لا ترفعوا اصواتكم فوق النبی . . . .

(Səsinizi Peyğəmbərin səsindən yuxarı qaldırmayın!" (٢)"

:Həm də ədəb qaydasına riayət etməyən başqa bir dəstəni məzəmmət edib buyurur

ان الذین ینادونک من وراء الحجرات اکثرهم لا یعقلون

(Ya Peyğəmbər!) Şübhəsiz, səni otaqların arxasından çağıranların əqli kəsmir!" (٣)"

Bu ayələri oxumaqla Malik Mənsura bildirir ki, Rəsulullahın (s) vəfatından sonrakı hörməti sağlığında olduğu kimidir. Əgər bu ayələr Peyğəmbərin (s) həyatına aid idisə, onlara istinad etməyin yeri yox idi. Beləliklə, Peyğəmbərin (s) insan üçün vasitə olması .həqiqəti Malik kimi insanın onun pak məqbərəsinə üz tutmasına səbəb olur

Sonra Rəsulullahın (s) vasitə olmasına iki nöqtə ilə ayrıca işarə edir. Biri budur ki, "qəbirlə üzbəüz dur", ikincisi budur ki, "onu özünə şəfaətçi qərar ver". Təvəssül və vasitənin mənası da elə budur. Yəni Rəsulullah (s) sənin şəfaətçin (vasitən) olduğu .üçün onunla üzbəüz durmalısan

Peyğəmbərin (s) vəfatından sonra ondan şəfaət tələb etməyin lazımlı bir iş olması – ۶
Malik ibn Ənəsin



---

.Maidə" surəsi, ayə ٣۵" . [١] -١
.Hucurat" surəsi, ayə ٢" . [٢] -٢
.Həmin mənbə, ayə ۴ . [٣] -٣

kəlamından aydın görünür. Malik şəfaəti haram və şirk sayan vəhhabilərin əksinə ".olaraq deyir: "O sənin şəfaətçin və vasitəndir

استشفع به

Ondan şəfaət tələb et" cümləsinin də mənası elə budur. Dünya işləri üçün bərzəx" aləmində Peyğəmbərə (s) təvəssül etməyin mümkünlüyü Malikin sözlərində öz təsdiqini tapır. Onu axirət işləri və günahlar üçün şəfaətçi qərar vermək caizdirsə, .dünya işləri üçün də şəfaətçi qərar vermək caizdir

Malikin sözündən aydın olur ki, müsəlmanlar Peyğəmbərin (s) hərəmində dua edən-٧ zaman qəbirlə üzbəüzə durub dua edərdilər. Əgər belə olmasaydı, Malik abbasi .xəlifəsinə "Qəbirlə üzbəüz dur", deməzdi

Bu münasibət İbn Teymiyyənin münasibətinin tam əksinədir. O deyir: "Əshab, onlara tabe olanlar və onların ardıcılları Peyğəmbərin (s) qəbri yanına gələn zaman yalnız ona salam verərdilər. Əgər dua etmək istəsəydilər, üzlərini qibləyə çevirər və qəbirdən (dönərdilər." (١

Malikdən nəql olunan bu rəvayət "əshab və onlara tabe olanlar Rəsulullahın (s) qəbri yanına gedib, o həzrətə təkcə



---

Maliklə xəlifə Mənsurun söhbəti Seyid Möhsin Əmin "Kəşful-İrtiyab" kitabında, . [١] -١ Səmhudinin və ondan qeyrilərinin "Vəfaul-Vəfa" kitabında nəql olunmuşdu r. "Xülasətul-Vəfa" kitabında nəql edir ki, bu hədisi Qazi Əyaz "Əl-şəfa" kitabında səhih sənədlə zikr etmişdir. Həmçinin Səmhudi "Xülasətul-Vəfa"da, Əllamə Qəstəlani "Əl-Məvahibul-lədunniyyə"də, Əllamə İbn Həcər "Tuhfətuz-zair vəl-cəvahirul-munəzzəm"də və "Həcc əməlləri"ni yazanlardan çoxu da Peyğəmbərin (s) ziyarət qaydalarında bunu qeyd etmişlə r. Əllamə İbn Həcər "Əl-Cəvahirul-Munəzzəm"də demişdir ki, bu rəvayət Malikdən səhih sənədlə çatmışdır və onda irad tutmaq üçün heç bir yer yoxdur. Əllamə Zərqani "Şərhul-Məvahib"də deyib ki, bu rəvayəti İbn Fəhd çox yaxşı sənədlə nəql etmişdir. Qazi Əyaz da bunu "Əl-Şəfa" kitabında səhih

sənədlərlə et mişdir. Onun ricalları (raviləri) siqədirlər (etibarlıdırlar), sənədlərində də .saxtakarlıq və yalan yoxdur

salam verərdilər, əgər dua etmək istəsəydilər, üzüqibləyə durub qəbirdən dönərdilər" .yalanının yetərli cavabıdır

Təkcə Malik yox, başqa məzhəb nümayəndələri də Peyğəmbərin (s) ziyarətində .qəbirlə üzbəüzə durub, dua və ziyarətnamə oxunmasının müstəhəbliyini zikr etmişlər

Təkcə vəhhabilər bir şəxsi qəbirlə üzbəüz durub dua oxuyan halda görsələr, ona .qəzəblənər və müşrik adlandırarlar

:İndi isə bu barədə olan fitvalara işarə edirik

Səmhudi Məhəmməd ibn Abdulla ibn Hüseyn Samiri Hənbəlidən nəql edir ki, "Əl--١ Mustəvəbu fi adabi ziyarətin-nəbi" kitabında demişdir: Qəbri öz üzünün müqabilində, :qibləni arxanda, minbəri sol tərəfində qərar verib öz duanda deyirsən

اللهم انک قلت فی کتابک لنبیک علیه السلام: "و لو انهم اذ ظلموا انفسهم جاؤک" و انی قد اتیت نبیک مستقرا فاسألک ان توجب لی المغفره کما اوجبتها لمن أتاه فی حیاته اللهم انی اتوجه الیک بنبیک صلی الله علیه و اله.

Əllahummə inni qultu fi kitabikə li nəbiyyikə ələyhissəlam "və ləv ənnəhum iz zələmu" ənfusəhum caukə" və inni qəd ətəytu nəbiyyikə mustəğfirən fə əsəlukə ən tucəbə liyəl-bağışlanmaə kəma əvcəbtəha li mən ətahu fi həyatihi, əllahummə inni ".ətəvəccəhu iləykə bi nəbiyyikə səlləllahu ələyhi və alihi

(Sonra uzun bir dua zikr edir.(١

Səmhudi Əbu Mənsur Kermanidən (Hənəfiyyə üləmasından) nəql edir: əgər bir şəxs -٢ :sənə sifariş etsə ki, mənim salamımı Peyğəmbərə (s) çatdır belə de



---

.Vəfaul-Vəfa", ٤-cü cild, səh. ١٣٧٨" . [١]-١

السلام علیک یا رسول الله! من فلان بن فلان یستشفع بک الی ربک بالرحمه و المغفره فاشفع له

Əssəlamu ələykə ya Rəsuləllah! Min filan ibn filan yəstəşfəu bikə ila Rəbbikə bir-"
(rəhməti vəl-bağışlanmai fəşfə ləh." (١

Bu salamda şəfaət də tələb olunmuşdur. Yəni Hənəfi məzhəbində də təvəssül və
.Peyğəmbərdən (s) şəfaət tələb etmək ziyarət qaydalarından hesab edilir

Şafei məzhəbindən nəql olunur: Bizim səhabələrin (Şafeinin) və başqalarının-٣ kəlamlarında deyilir ki, ziyarət edən şəxs salam, dua və təvəssül zamanı üzünü (Peyğəmbərin (s) şərafətli üz tərəfinə tutsun. Bu həm də İbn Hənbəlin də nəzəridir.(٢

Xülasətul-Kəlam" kitabında deyilir: Dörd məzhəb alimlərindən çoxu "Həcc əməlləri""-۴ kitabında Peyğəmbərin (s) ziyarətini zikr edən zaman deyirlər: "Ziyarət edən şəxs üçün müstəhəbdir ki, şərafətli qəbirlə üzbəüz dayanıb, günahlarının bağışlanması üçün (Allaha təvəssül etsin və o həzrəti (s) vasitə qərar versin." (٣

Həmçinin deyir: Həcc əməllərini yazan alimlər "Həcc əməlləri" kitabında deyirlər: "Dua və ziyarət zamanı Peyğəmbərin (s) qəbri ilə üzbəüz dayanmaq üzüqibləyə ".dayanmaqdan əfzəldir

Tədqiqatçı Əllamə Kamal ibn Həmmam demişdir: Şərif qəbirlə üzbəüz dayanmaq-۵ üzüqibləyə dayanmaqdan əfzəldir. Amma Əbi Hənifədən nəql olunur ki, üzüqibləyə dayanmaq daha əfzəldir. Bu nəzər imamın (Əbu Hənifənin) öz "Müsnəd"ində İbn Ömərdən nəql etdiyi



---

.Həmin mənbə və "Kəşful-İrtiyab", səh. ۲۵۶ . [۱]-۱
.Kəşful-İrtiyab", səh. ۲۶۱; "Vəfaul-vəfa", ۴-cü cild, səh. ۱۳۷۸" . [۲]-۲
.(Vəfaul-Vəfa", ۴-cü cild, səh. ۱۳۷۸ (azca fərqlə" . [۳]-۳

rəvayətə ziddir: "Kəramətli qəbirlə üzbəüz dayanmaq və qibləyə arxa çevirmək ".(sünnətdəndir (müstəhəbdir

Səmhudi deyir: Qeyd olunmuş tədqiqatçı alimdən (Kamal ibn Həmmamdan) qabaq İbn Cəmaət də Peyğəmbərin (s) şərif qəbri ilə üzbəüz dayanmağın müstəhəbliyini imam (Əbi Hənifədən nəql etmişdir.(١

Xülasətul-Kəlam"da "Cəvahirul-Münəzzəm"dən nəql edilir ki, Peyğəmbərin (s) qəbri" ilə üzbəüz dayanmağın əsası budur: Biz bu nəzərdə müttəfiqik ki, Peyğəmbər (s) öz qəbrində (bərzəx aləmində) diridir və onu ziyarət edənlərdən agahdır. Əgər o diri olsaydı, onu ziyarət edən şəxsin üzbəüz dayanması zəruri olardı. O həzrətin (s) şərif qəbrini ziyarət edəndə də qəbirlə üzbəüz durub, qibləyə arxa çevirmək lazımdır. Çünki .o indi də diridir

Sonra deyir: Əllamə Zərqani "Şərhul-Məvahib" kitabında demişdir: Peyğəmbərin (s) qəbri ilə üzbəüz durmuş halda (arxası qibləyə) duanın müstəhəbliyi Maliki üləmasının yekdil rəyidir. İmam Əbi Hənifənin məzhəbindən sonra Şafei və Cümhur da bu kimi .münasibətlər nəql edirlər

Amma imam Əhməd ibn Hənbəlin məzhəbinin alimləri arasında baxışlar fərqlidir. Onların alimləri arasında üstün nəzər budur ki, o biri məzhəblər kimi şərif qəbirlə (üzbəüz dayanılsın.(٢

Səmhudi Əyazdan nəql edir: "Malik, İbn Vəhəbin rəvayətində deyib: Əgər Peyğəmbərə (s) salam verib dua etsən, üzünü qibləyə tərəf deyil, qəbirə tərəf tutmuş halda dayan." ((٣

İbn Yunis Malikidən sonra İbn Həbibdən nəql edir: "Sonra qiblə tərəfdən qəbirə tərəf gəlirsən və ona yaxınlaşıb vüqarlı halda salam verirsən, həmd-səna



---

.Həmin mənbə, ۴-cü cild, səh. ۱۳۷۸ . [۱]-۱

.Kəşful-İrtiyab", səh. ۲۶۱" . [۲]-۲

deyirsən. Çünki o qarşısında dayandığını bilir, səni eşidir."

Səmhudi "Rüusul-Məsail" kitabında Novidən, o da Hafiz Əbi Musa İsfahanidən, o da Malikdən nəql edir: "Əgər bir şəxs Peyğəmbərin (s) qəbri yanına gəlmək istəsə, arxasını qibləyə, üzünü Peyğəmbərə (s) çevirsin. Ona salavat göndərib və dua etsin." (۱)

۶- İbrahim Hərbi "Həcc əməlləri" kitabında demişdir: "Arxanı qibləyə çevirirsən, üzünü də qəbrin ortasına tutursan." (۲)

Təlhə ibn Məhəmməd Əbi Hənifənin "Musnəd"ində öz sənədi ilə belə nəql edir: "Əyyub Səxtyani Peyğəmbərin (s) qəbri yanına gəlib arxası qibləyə dayandı və ağladı. O özünü ağlamağa vurmamışdı, həqiqətən ağlayırdı." (۳)

۷- Mucid Luğəvi deyir: İmam Əbu Əbdürrəhman Abdulla ibn Mübarəkdən nəql olunmuşdur: "Əbu Hənifədən belə eşitdim: Əyyub Səxtyani Mədinəyə gələndə mən də orada idim. Dayandım ki, görüm nə edir? Gördüm ki, arxasını qibləyə, üzünü Rəsulullaha (s) tərəf çevirib ağlayır. O həqiqətən ağlayırdı. Əyyub fəqih bir alim idi!" (۴)

۸- Səbki deyir: "Alimlərin əksərinin nəzəri (bu daha yaxşı nəzərdir) budur ki, ölmüş şəxslə diri kimi rəftar edilsin. Diri şəxsə üzbəüz salam verildiyi kimi ölmüş şəxsə də üzbəüz salam verilsin. Bu zərurətə şübhə etmək düzgün deyil." (۵)

۹- Mətəri deyir: Keçmişdə məscidin otaqlarına daxil olmamışdan qabaq Peyğməbərə (s) salam vermək istəyəndə arxası rövzə və tövbə sütunu yerləşən tərəfə, üzü o həzrətin (s) qəbrinə tərəf durardılar. Yəhya da Əli ibn Hüseyndən (ə) nəql edir ki, o Həzrət (ə) bu qaydada salam verərdi. Yəhya mötəbər bir sənədlə Əbu Əlqəmə Ğərəvi

səh:۶۱

---

۱- [۱]. "Vəfaul-Vəfa", ۴-cü cild, səh. ۱۳۷۷.

۲- [۲]. Həmin mənbə.

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Həmin mənbə, səh. ۱۳۷۸.

Kəbirdən nəql edir ki, camaat həmişə məsciddə Peyğəmbərin (s) evinə daxil olmazdan qabaq onun qapısı ağzında durar və salam verərdilər.

Düşünürəm ki, o zaman Peyğəmbərlə (s) üzbəüz durmaq imkanı yox idi. Buna görə də Mətəri belə demişdir. Rəsulullahın (s) evi və o həzrətin (s) qadınlarının otaqları məscidin içində müəyyənləşəndən sonra camaat arxası qibləyə və üzü Peyğəmbərə (s) tərəf durar və salam verərdilər. Deməli, arxası qibləyə durmaq cümə xütbəsində, fitr bayramı xütbəsində, qurban bayramı xütbəsində və digər şəri xütbələrdə müstəhəb olduğu kimi bu halda da müstəhəbdir. Bu "Ət-Tuhəf" kitabında İbn Əsakirin sözüdür.(١)

١٠- İbn Zubalə Sələmə ibn Vərdandan nəql edir: "Ənəs ibn Malik nə vaxt Peyğəmbərə (s) salam vermək istəsəydi, o həzrətin (s) müqabilində dayanardı. Bizim səhabələrin kəlamında deyilir ki, ziyarətçi üzü Peyğəmbərin (s) şərif üzünə tərəf salam verər, dua və təvəssül edər. Sonra Peyğəmbərin (s) qəbri sol tərəfində, minbər sağ tərəfində, üzüqibləyə durmuş halda dayanar və dua edər." (٢)

Bu mətndə də təvəssül məsələsinə işarə olunmuşdur.

## MƏHƏMMƏD İBN ƏBDÜL-VƏHHABIN PARALOGİZMİ

(YANLIŞ MÜQƏDDİMƏDƏN YANLIŞ NƏTİCƏSİ)

O "Kəşfuş-şubəhat" risaləsində müşrik hesab etdiyi müsəlmanlara qarşı dəlillər sistemi təqdim edir:

١- Allahı çağırmaq, dua etmək və ondan kömək istəmək ibadətdir. Əgər Allahdan istədiyin kimi Peyğəmbəri (s), ya saleh bəndələrdən birini çağırsan, dua hesab olunan bu



---

١- [١]. Həmin mənbə.

ibadətdə Allaha şərik qərar vermisən. Dua nəinki ibadətdir, hətta ibadətin mahiyyətini .təşkil edir

Müşriklərin bütlər müqabilində ibadəti dua etmək, bütləri çağırmaq, onlar üçün-۲ qurban kəsməkdən başqa bir şey deyildir. Çünki müşriklər özləri bilir və etiraf edirdilər ki, bütlər, taxtalar və daşlar işdə təsirli, fəal deyil. Yaratmaq, ruzi vermək və digər işlər .Allahın əlindədir

Müşriklər deyirdilər: biz bütlərə ibadət edirik ki, bizi Allaha yaxınlaşdırırlar. Həmin-۳ münasibəti müsəlmanlarda da görürük. Onlar Peyğəmbəri (s), saleh bəndələri şəfaətçi .və vasitə qərar verirlər

Şirk təkcə bütpərəstlərə məxsus deyil. Mələkləri, İsa Məsihi (ə), saleh bəndələri də-۴ .dua və ibadətdə şərik qərar verənlər var

Cavab: Dua və ibadətin mənası haqqında araşdırmalardan aydın oldu ki, hər istək, hər çağırış, hər duanı ibadət saymaq düzgün deyil. Yalnız bəzi dualar - Allahdan istək, Onun müqabilində mütiliklə çağırış, Onunla raz-niyaz kimi dualar ibadətdir. Əgər bir şəxs Allahı çağırsa, "Rəbbinizə yalvara-yalvara, həm də gizlincə dua edin" ayəsinə əməl etsə, eyni zamanda Peyğəmbəri (s), övliya və saleh bəndələrdən birini şəfaətçi qərar versə, ondan özü üçün dua etməsini istəsə, bu şəxs yalnız Allaha ibadət etmiş olur və ibadətdə də Allahdan qeyrisini şərik qərar verməmişdir. Peyğəmbərdən (s) dua və şəfaət diləmək o həzrətə (s) ibadət, onu şərik qərar vermək deyil. "Müşriklərin ibadəti də duadan, onları çağırmaqdan, bütlər üçün qurban kəsməkdən başqa bir şey :deyildi" bənzətməsinə belə cavab vermək olar

Müşriklər bütləri sadəcə kömək üçün çağırmırdılar, onlara pərəstiş edirdilər..۱ Müşriklər onları məbud, işlərin

müdiri bilir və onlara ibadət edərdilər. Bu iddiaya sübut olan ayələrdən bəzilərini :nəzərdən keçirək

اذ قال لأبيه و قومه ما هذه التماثيل التى أنتم لها عاكفون

İbrahim atasına (əmisinə) və tayfasına: "Sizin tapınıb və durduğunuz bu cansız" (heykəllər nədir?" –dediyi zaman" (١)

قال وجدنا آباءنا لها عابدين

(Onlar: "Biz atalarımızı onlara ibadət edən gördük!" – deyə cavab vermişdilər." (٢"

قال بل ربكم رب السماوات و الارض الذى فطرهن و أنا على ذالكم من الشاهدين

İbrahim belə cavab vermişdi: Xeyr, Rəbbiniz göylərin və yerin Rəbbidir, onları" (yaratmışdır. Mən bunlara şahidlik edənlərdənəm." (٣

İbrahimin (ə) buyurduğu "Rəbbiniz göylərin və yerin Rəbbidir, onları yaratmışdır" cümlədən aydın olur ki, müşriklər bütləri öz işlərinin müdiri və pərvərdigarı bilirdilər. :Sonra həzrət İbrahim (ə) buyurur

قال أفتعبدون من دون الله ما لا ينفعكم شيئا و لا يضروكم

İbrahim dedi: Elə isə Allahı qoyub sizə heç bir xeyir və zərər verə bilməyən bütlərəmi" (ibadət edirsiniz?" (٤

Quran ayələrinə əsasən, müşriklərdən çoxunun şirki, xüsusilə Məkkə müşriklərinin şirki Allaha ibadətdə idi və onlar Allahdan qeyrisinə pərəstiş edərdilər. Onlar allahlarının müqabilində səcdə edir, onlar üçün qurban kəsərdilər. Buna görə də Allah-taala "Kafirun" surəsində



---

.Ənbiya" surəsi, ayə ۵٢" . [١] -١
.Ənbiya" surəsi ayə ۵٣" . [٢] -٢
.Ənbiya" surəsi, ayə ۵۶" . [٣] -٣

:Peyğəmbərə (s) əmr edir

قل يا ايها الكافرون. لا أعبد ما تعبدون. و لا انتم عابدون ما أعبد. و لا أنا عابد ما عبدتم.

!De ki: Ey kafirlər"

!Mən sizin ibadət etdiklərinizə ibadət etmərəm

!Siz də mənim ibadət etdiyim Allaha ibadət etməzsiniz

(Mən sizin ibadət etdiklərinizə heç vaxt ibadət edən deyiləm!" (۱

Beləliklə, müşriklərin allahlar və müxtəlif rəblər müqabilində ibadəti onları çağırmaq və kömək istəməklə başa çatmırdı. Əlbəttə, onlar öz allahlarından kömək də istəyirdilər. Lakin onların şirki kömək istədiklərinə görə deyildi. Hətta insandan kömək istəməyin özü Allaha şərik qərar vermək deyil. Yoxsa bir-birlərindən kömək istəyən insanların .hamısı müşrik hesab olunmalıdır

İkinci: Müşriklərin etiqadı bu idi ki, işlər tədbirçi, idarə edən allahların öhdəsinə qoyulmuşdur. Ötən bəhslərdə şirkin növlərini izah etdik və dedik ki, onun mənşəyi ibadətdə, xaliqiyyətdə (yaratmaqda), rübubiyyətdə (rəblikdə) və aləmdəki işlərin tədbirçisi olmaqdadır. Məsələn, müşriklərdən bəziləri inanırdılar ki, varlıq aləmi yaradılandan sonra işlərin tədbiri (yerinə yetirilməsi) ruhlara, mələklərə, ya cinlərə tapşırılmişdir. Onlardan hər birinə heykəl düzəldər, onların müqabilində ibadət edərdilər. Buna əsasən cahil ərəblər arasında kimisi mələklərə, kimisi cinlərə, kimisi Şira (Böyük Köpək və Kiçik Köpək adlanan ulduzlar sistemində iki ulduzun adı) ulduzuna, kimisi də pərvərdigar saydığı sabit ulduzların mücəssəmələrinə ibadət .edirdilər

Onlar yonulmuş daşları və taxtaları dünyada təsirli sayır, ruhların, mələklərin və digər mövcudların mücəssəməsi



---

.Kafirun" surəsi, ayə ۱-۴" .[۱]-۱

bilirdilər. İndi də dünyadakı bütpərəstlər ruhlar, ya mələklər üçün müxtəlif şəkillərdə heykəllər, mücəssəmələr düzəldirlər. Onlar hər bir iş və hər bir tədbir üçün büt və .məxsus bir mücəssəmə düzəldib ona ibadət edirlər

Əlbəttə, onlar Allahı yaranışın əsil səbəbi sayırlar. Lakin inanırlar ki, yaranışdan sonra hər iş bir allaha və pərvərdigara tapşırılmışdır. Buna görə də onlara ibadət edirlər. .Beləliklə, müşriklər varlıq aləminin idarə olunmasında da Allaha şərik qərar vermişlər

Onlar işlərin tədbiri üçün ayrıca allahların olmasına inanır, hər işi uyğun sahədə tədbirçi və təsirli allahdan istəyərdilər. İndi də hər bir istəyi ona məxsus büt və mücəssəmədən istəyirlər. Məsələn, bir şəxsin evlənmək və nikah işinə aid istəyii olsa, bunu xüsusi bütdən istəyər və onun müqabilində pərəstiş edir. Onlar inanırlar ki, bu işin tədbiri xüsusi bir mələk, ya ruha tapşırılmışdır. Mələk ya ruha əli çatmadığı üçün .onun heykəli və bütü müqabilində istəklərini izhar edirlər

Quranda Allahdan qeyrisinə ibadət və onun rəblik məsələsi ciddi müzakirə olunub. Bir :çox ayələrdə dünya işlərinə müdiriyyətin Allaha məxsus olduğu bildirilib

ان ربكم الله الذى خلق السـماوات و الارض فى سـته ايام ثم استوى على العرش يدبر الامر ما من شفيع الا من بعد اذنه ذلكم الله ربكم فاعبدوه أفلا تذكرون

Rəbbiniz göyləri və yeri altı gündə xəlq edən, sonra ərşi yaradıb hökmü altına alan," hər işi yoluna qoyan (sahmana salan) Allahdır. Onun izni olmadan heç bir şəfaət edən (ola bilməz. Bu, Rəbbiniz olan Allahdır. Ona ibadət edin." (١

:Bu ayədə diqqəti cəlb edən bir neçə nöqtə vardır



---

.Yunus" surəsi, ayə ۳" .[١]-١

Birinci nöqtə budur ki, insana rəblik göyləri və yeri yaradan Allaha məxsusdur. Bu, Allahdan qeyrisinin hər cür müdiriyyətini inkar edir. Çünki müşriklər Allaha :müdiriyyətdə şərik qoşurdular. Başqa bir ayədə buyurulur

و لئن سألتهم من خلق السماوات و الارض ليقولن الله

Əgər sən onlardan: "Göyləri və yeri kim yaratmışdır?" - deyə soruşsan, onlar mütləq" ("Allah!" - deyə cavab verəcəklər." (١)

Ayədə buyurulur ki, göyləri və yeri yaradan Allah sizin Rəbbinizdır. Müdiriyyət (.yaradıcılıqdan ayrı deyil. (rəbliklə yaratmaq eynidir

İkincisi nöqtə budur ki, bütün işlərin tədbiri (qaydaya salınması) başqlarının yox, məhz .Onun əlindədir

Üçüncüsü nöqtə budur ki, buyurur: Sizin Rəbbiniz düşüncənizdə, əlinizlə ruhlardan və .mələklərdən düzəltdiyiniz bütlər yox, yeganə Allahdır

Dördüncüsü nöqtə budur ki, Allahın rəbb olmasında ona ibadət məsələsi şərtdir. "Fəbuduh" "فاعبدوه" :Buyurulmuşdur

Fəbuduh" kəlməsində "fa" hərfi ayrıca bir məna bildirir. Yəni yalnız Allah sizin" Rəbbiniz olduğu üçün yalnız Ona ibadət edin. Burada ibadətlə rəblik arasında rabitə .yaranır

Beşincisi nöqtə: ayənin ahəngindən (deyilişindən) aydın olur ki, bu məntiq müqabilində müşriklərin məntiqi durmuşdur. Çünki işlərin tədbirini (qaydaya salınmasını) və rəbliyi Allahdan qeyrisinə aid edirlər, ibadətləri də müxtəlif bütlərədir. Quran rəblikdə və .ibadətdəki şirki inkar edir

ma min şəfiin illa min bədi" "ما من شفيع الا من بعد اذنه " ,Altıncısı



---

.Loğman" surəsi, ayə ۲۵" . [۱] -۱

iznihi" cümləsi bu mənanı bəyan edir ki, Onun izni olmadan dünya işlərinə (işlərin qaydaya düşməsinə) kimsə müdaxilə edə bilməz, vasitəçi ola bilməz. Demək, əsl səbəb Sübhan Allahın özüdür. Bütün səbəblər Onda qurtarır və heç bir səbəb müstəqil deyil. Bu ayədə şəfaət deyərkən işlərin tədbirindəki vasitəçilik nəzərdə tutulur. Müşriklərin özləri ilə Allah arasındakı müstəqil şəfaətçiləri inkar edir. Çünki şəfaət və .vasitəçilik Onun izni ilə olmalıdır

ان الله ربى و ربكم فاعبدوه هذا صراط مستقيم

Şübhəsiz ki, Allah mənim də, sizin də Rəbbimizdir. Yalnız Ona ibadət edin. Bu, doğru" (yoldur!" (١)

رب السماوات و الارض و ما بينهما فاعبدوه وأصطبر لعبادته هل تعلم له سميعا

O, göylərin və yerin, onların arasında olan hər şeyin Rəbbidir! Yalnız Ona ibadət et və" (Onun ibadətinə səbirli ol! Heç Ona bənzərini tanıyırsanmı?" (٢)

. . . ان الله ربى و ربكم فاعبدوه هذا صراط مستقيم

(Allah mənim də, sizin də Rəbbimizdir. Yalnız Ona ibadət edin. Bu, doğru yoldur!" (٣"

Bu ayələr ibadətdə Allahın rəbliyini önə çəkir, ibadətdə tövhidlə rəblikdəki tövhidin sıx "!əlaqəsini bəyan edir. İkinci və dördüncü ayədə buyurulur: "Bu doğru yoldur

Hər iki ayə həzrət İsaya (ə) aiddir və hər iki ayədə İsanın ilahiliyinə etiqadı olanlara dəlil göstərilir ki, onu və bütün insanları yaradan Allahdır. O, tək pəbb və yaradan olduğu üçün ibadət də Ona məxsusdur. Nəticə budur ki, Allah-taalaın hər bir işdə rəbliyi mütləq, qeyd-şərtsizdir. Onun rəbliyi əhatəsində olmayan şey yoxdur. Bu səbəbdən



---

.Zuxruf" surəsi, ayə ۶۴" . [١] -١

.Məryəm" surəsi, ayə ۶۵" . [٢] -٢

.Həmin mənbə, ayə ۳۶ . [٣] -٣

.də Ona ibadətdə möhkəm olmaq, başqa birinə üz tutmamaq lazımdır

Xülasə: İkinci müddəanın cavabında deyilir ki, ayələrə diqqət yetirdikdə bir neçə nəticə :əldə edirik

Müşriklərin şirki, həm rübubiyyətdə (rəblikdə) və işlərin tədbirində (qaydaya-١ salınmasında) və həm də ibadətdə idi. Buna görə də rübubiyyətdə (rəblikdə) və işlərin .tədbirindəki tövhidə Quran ayələrində xüsusi yer verilir

İbadətdəki şirkin mənşəyi rübubiyyətdə (rəblikdə) idi. Buna əsasən Quran-٢ .ibadətdəki tövhidi rübubiyyətdə (rəblikdəki) tövhiddən, onun bir şaxəsi sayır

Müşriklərin şirkinin onların bütlərdən kömək istəməsi ilə əlaqəsi yoxdur.Demək,-٣ peyğəmbər və övliyalardan onların qəbirləri yanında kömək istəməklə bütpərəstlərin .daş və taxtadan kömək istəməsi arasında böyük fərq var

.Birinci: Bütpərəstlərin şirki bütlərinin ilahiliyinə olan etiqaddan qaynaqlanır

İkincisi: Müsəlmanlar heç vaxt qəbirlərdən, yəni binadan, daşdan, taxtadan, qızıl-gümüşdən kömək istəmirlər. Onlar peyğəmbərlərin, övliyaların ruhlarından dua istəyirlər. Onlar peyğəmbərlərin və övliyaların ilahiliyinə inanmır, onları Allahın xalis bəndələri bilirlər. Bu iki halın bir-birinə bənzədilməsi ya insafsızlıqdan, ya da .müsəlmanların əqidələrindən xəbərsizlikdən irəli gəlir

Üçüncü yanaşmada Məhəmməd ibn Əbdülvəhhab peyğəmbər və övliyaların Allah yanında şəfaətçi (vasitəçi) seçilməsini bütpərəstlərin şəfaətçi seçməsi ilə müqayisə etmişdir. Bütpərəstlər deyirdilər: "Biz bütlərə bizi Allaha yaxınlaşdırmaları üçün ibadət ."edirik." (١) O deyir: "Bu həmin müşrik müsəlmanların işidir

Bu paralogizmi (müğalitəni - məntiqdə yanlış



---

.Zumər" surəsi, ayə ٣" .[١]-١

müqəddimədən çıxarılan yanlış nəticə) şərh edib cavablandırmaq üçün əvvəlcə müşriklərin şəfaətçi seçməsi mövzusunu nəzərdən keçirmək lazım gəlir. Bu barədə iki :ayə nazil olmuşdur. Ayələrdən birində buyurulur

و يعبدون من دون الله ما لا يضروهم و لا ينفعهم و يقولون هؤلاء شفعاؤنا عند الله . . .

Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir" (və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!" - deyirlər." (١)

Bu ayədə müşriklərin "bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir" sözü bütlərə ibadətin səbəbi kimi göstərilir. Yəni bütlərə ibadətin səbəbi budur ki, onlar .bizim şəfaətçimiz və vasitəmizdirlər. Bütlərə yaxınlaşmaqla Allaha yaxınlaşmış oluruq

:Digər ayədə də həmin nöqtə bütlərə ibadətin səbəbi kimi qeyd olunur və buyurulur

. . . والذين اتخذوا من دونه أولياء ما نعبدهم الا ليقربونا الى الله زلفى . . .

Allahı qoyub Ondan qeyrisini (bütləri) özlərinə dost tutanlar: "Biz onlara yalnız bizi" (Allaha yaxınlaşdırmaları üçün ibadət edirik!" - deyirlər." (٢)

Onların məntiqində daş, taxta və öz əlləri ilə düzəltdikləri mücəssəmələr onlar üçün yaxınlaşmaq vasitəsidirmi? Axı daşın və taxtanın düşüncəsi yoxdur! Bəs necə ola bilər ?ki, onlar Allaha yaxınlaşmaq üçün vasitə və şəfaətçi olsunlar

Cavab olaraq deməliyik ki, bütpərəstliyin əsasını varlıq aləminin bir hissəsində tədbirçi ,güman etdikləri bütlərə pərəstiş və ibadət təşkil edir. Müşriklər inanırdılar ki



---

.Yunus" surəsi, ayə ١٨" .[١]-١

.Zumər" surəsi, ayə ٣" .[٢]-٢

Allah-taalanın dərgahına müstəqil yaxınlaşa bilməzlər. Maddədən, torpaqdan yaranmış insan hara, uca Allah hara?! Demək, müxtəlif rəblər vasitəsilə Onun dərgahına yaxınlaşmaqdan başqa yol yoxdur. Çünki Allah-taala yaratdıqlarına müdiriyyəti onlara tapşırmışdır. Bütpərstliyə əsasən, insan rəbləri görmədiyinə görə onlara oxşar müxtəlif mücəssəmələr və heykəllər düzəldir. Həqiqətdə isə daş və taxtaya yox, müxtəlif rəblərə pərəstiş olunur. Əlbəttə, çox vaxt avam camaat bütlərlə rəblər arasında fərq qoymadan pərəstiş edirlər. Bu, bütpərəstliyin mahiyyətidir. Amma zaman ötdükcə və nəsillər dəyişdikcə, ibadət və pərəstiş bütlərdə xülasələşdi, vasitəçilik və şəfaət bütlərin ixtiyarına verildi. Müxtəlif rəblər olan cinlər, mələklər və ruhlar unuduldu, xüsusilə avam camaat və kütlə arasında yaddan çıxarıldı. Buna görə də Quran müşriklərin dilincə həm ibadət və pərəstişi, həm də şəfaəti bütlərə aid edir. :İndi isə bu iki ayənin mətninə qayıdaq. Quran birinci ayədə buyurur

و يعبدون من دون الله ما لا يضروهم و لا ينفعهم و يقولون هؤلاء شفعاؤنا عند الله

Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən başqalarına ibadət" (edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!" –deyirlər." (١

Bu ayədə "bütlərə ibadət edirlər" ifadəsinin əvəzinə "onlara nə bir xeyir, nə də bir zərər verə bilən" ifadəsi işlədilmişdir. İşarə olunur ki, bütlərə ibadət o zaman faydalı olardı ki, onlar şüurlu bir varlıq olaydılar və bütpərəstlərin onlara pərəstiş etdiyini dərk edəydilər. Sonda Allah dərgahında şəfaət verəydilər. Halbuki onlar ölü və şüursuz cismlərdir. Nə bir şey anlayır, nə də xeyir, ya zərər verə bilirlər. Daha sonra :buyurmuşdur



---

.Yunus" surəsi, ayə ١٨" .[١]-١

. . . أتنبؤن الله بما لا يعلم فى السماوات و لا فى الارض . . .

(Allaha göylərdə və yerdə (Özünə şərik) bilmədiyi bir şeyimi xəbər verirsiniz?" (١)"

Yəni Allah Özü yaratdığı, aləmdəki işlərin idarə edilməsini tapşırdığı, Öz dərgahına təyin etdiyi şəfaətçilərdən xəbərsizdirmi? O nə göylərdə, nə də yerdə belə allahlar tanımır. Bunun özü ən çirkin iftiralardan biridir. Mümkündürmü aləmdə belə bir şey !?olsun və Allah ondan xəbərsiz qalsın

Bu, həmin allahların olmadığını çatdıran kinayədir (yəni dolayısı ilə bir mənanı ifadə edən söz). Elə bil ki, bir şəxs başqa bir şəxsə deyir: "Filan işi siz etmisiniz?" O "etməmişəm" əvəzinə deyir: "Bunların baş verməsindən xəbərim yoxdur." Ardınca :buyurulur

سبحانه و تعالى عما يشركون

"!Allah Ona şərik qoşulan bütlərdən uzaq və ucadır"

.Bu cümlə Allahın şəriklik sifətindən pak olduğunu göstərir

Bu ayədə müşriklərin əleyhinə iki dəlil göstərilmişdir. Biri "onlara nə bir xeyir, nə də bir zərər verə bilən" cümləsi, digəri "Allaha göylərdə və yerdə (Özünə şərik) bilmədiyi bir .şeyimi xəbər verirsiniz?" cümləsidir

:Haqqında danışacağımız ikinci ayə isə "Zumər" surəsindədir. Ayədə buyurur

. . . والذين اتخذوا من دونه أولياء ما نعبدهم الا ليقربونا الى الله زلفى . . .

Allahı qoyub (bütləri) özlərinə dost tutanlar: "Biz onlara yalnız bizi Allaha" (yaxınlaşdırmaq üçün ibadət edirik!" –deyirlər." (٢)

.Ötən bəhslərə nəzər salsaq, ayənin məqsədi aydın olar



---

.Həmin mənbə . [١] -١

Müşriklər etiraf edirlər ki, Allah-taaladan başqa dünyanın işləri ilə məşğul olan, onları qaydaya salan, idarə edən rəblər mövcuddur. Deməк, müşriklərin nəzərincə bu rəblər işləri idarə edənlərdir. Bizə dəyəcək zərərlərdən qorunmaq və mənfəətlərdən .faydalanmaq üçün həmin rəblərin müqabilində itaət və təzim etməliyik

Ayədə "özünə dost tutmaq" dedikdə müşriklərin Allahdan qeyrisini özlərinə rəbb seçməsi nəzərdə tutulur. "Dost" təbiri həmin rəblərə işarədir. Onlar deyirlər ki, biz bu bütlərə bizi Allaha yaxınlaşdırmaları üçün pərəstiş edirik. Müxtəlif rəblər vasitəsilə .yaxınlaşmaq onların Allah yanında şəfaətinin nümunəsidir

Bu iki ayədə eyni məqsəd izlənir. Bütlərin və ya müxtəlif rəblərin Allah hüzurunda .şəfaət etməsi bütlər vasitəsilə Allaha yaxınlaşmaqdır

Yunis" surəsində şəfaət qaydası, onun necəliyi, müşriklərin xürafi işləri barədə" :danışılır

ما نعبدهم الا ليقربونا الى الله زلفى

".Biz onlara yalnız Allaha yaxınlaşdırmaq üçün ibadət edirik"

İndi isə bu iki şəfaət arasındakı fərqləri nəzərdən keçiririk. Yəni müşriklər üçün bütlərin şəfaəti ilə müsəlmanlar üçün peyğəmbər və övliyaların şəfaəti arasındakı fərqləri. Bu iki şəfaət bir çox cəhətlərdən, həm tələb, həm şəfaət edənlər, həm şəfaət olunanlar, .həm də şəfaətin özü baxımından xeyli fərqlənir

Əvvəlcə, şəfaət olunan şəxsin üz tutduğu vasitələrə nəzər salaq. Bütpərəstlərin və müşriklərin istədiyi şəfaət ibadət vasitəsilə yerinə yetirilir. Bu vasitə ibadət və pərəstişdə olan həmin şirkdir. Bütün peyğəmbərlər və xüsusilə İslam peyğəmbəri (s) ibadətdə şirki öz mübarizələrində hədəf seçmişdi. Haqqında danışdığımız iki ayədə bu məsələyə işarə

olunmuş və müşriklərin əməlləri məzəmmət edilmişdir. Diqqət yetirmək lazımdır ki, şəfaət istəmək öz-özlüyündə şirk və şəfaət edənə pərəstiş deyil. Vəhhabilər bunu şəfaəti haram göstərmək üçün əllərində vasitə etmişlər. Onlar bu ayəni şirkə, Peyğəmbərdən (s), ilahi övliyalardan şəfaət tələb etməyin haram olmasına dəlil .göstərirlər. Çünki ayələrdən heç biri bu məsələyə dəlil deyil

Quran bu iki ayədə müşrikləri bütlərdən şəfaət istədikləri üçün yox, Allahdan başqalarına ibadət etdikləri üçün məzəmmət edir. Onların müşrik olmasının səbəbi .şəfaət istəyi yox, bütpərəstlikləridir

Bütlərə pərəstiş şəfaət istəyindən fərqli bir şeydir. Hərçənd ki, şəfaət istəyinin ünvanı .onların ibadət və pərəstiş ünvanı ilə eynidir

Müşriklər bütlərin və ya müxtəlif rəblərin müqabilində onların Allah dərgahında şəfaətçi olması üçünmü ibadət edirlər? Onların ibadət məqsədini təsdiqləyən nöqtələri :nəzərdən keçirək

.Onlar bütlərə ibadət edirlər. Bu əməl onların ibadətdəki şirkidir .١

Onlar inanırlar ki, işlərə müdiriyyət bütlərə və müxtəlif rəblərə tapşırılıb. Demək, bu .٢ cəhətdən də rububiyyətdə (rəblikdə) müşrikdirlər və dünya işlərinə müdiriyyətdə .Allaha şəriklərin olmasına inanırlar

Onlar bütlərə, yaxud müxtəlif rəblərə ona görə ibadət edirlər ki, onlara şəfaət.٣ etsinlər və Allah-taalanın dərgahına yaxınlaşmaqda onlar üçün vasitə olsunlar. Bu .cəhətdən də şəfaət istəyi təzim və ibadətə uyğun gəlir

Bəli, bu halda da bir növ etiqadi şirk vardır. Bütləri və ya müxtəlif rəbləri şəfa verməkdə müstəqil, ixtiyar sahibi və Allahdan ehtiyacsız bilmələri də şirkdir.Onların əqidəsincə, Allahın başqa işlərdə olduğu kimi bu işlərdə

də heç bir təsiri yoxdur. Belə bir etiqadla rübubiyyətdə (rəblikdə) və işlərin tədbirində şirkləri olacaq. Lakin yenə də onların istək və tələbinin özü ibadətdə yox, rübubiyyətdə şirkdir. Şəfaət istəyinin ünvanı onların şirkinə səbəb olmamışdır. Onların bütlərin, yaxud müxtəlif rəblərin müstəqil olmasına etiqadı, ibadətdə yox, rübubiyyətdə və .işlərin tədbirində şirk səbəbidir

Amma müsəlmanların Peyğəmbərdən (s) və ilahi övliyalardan şəfaət istəməsinin müşriklərin əməllərinə heç bir oxşarlığı yoxdur. Əvvəla, müsəlmanlar nə peyğəmbərə, nə də ilahi övliyalara ibadət edirlər. Nə onların ilahiliyinə etiqadları var, nə də şəfaət məsələsində onları müstəqil və ixtiyar sahibi bilirlər. Onlardan istədikləri yalnız duadır. Bu dua həm dünya, həm də axirətə aid ola bilər. Məsələn, günahların bağışlanması kimi. Onlar Allah dərgahına yaxınlaşmaq istəyirlərsə, bu işdə vasitəçini müstəqil təsəvvür etmirlər. Beləliklə, Peyğəmbər (s) və ilahi övliyalardan şəfaət istəmək nə ibadətdə, nə rübubiyyətdə şirkdir. Onlar şəfaət edənləri şəfaət işində ixtiyar sahibi bilmir, onları Allahın xalis bəndələri sayırlar. Halbuki müşriklərin bütlərdən və sənəmlərdən (mücəssəmələrdən) şəfaət istəməsi tam bunun əksinədir. Müşriklər bütlərə etiqadlı olduqları halda müsəlman bir şəxs nə Peyğəmbərə (s) ibadət edir, nə .də onun rübubiyyətinə, ilahiliyinə inanır

Bu iki növ şəfaətin bir fərqi də budur ki, müsəlmanların üz tutduğu şəfaətçilər Allahın izni olmadan şəfaət edə bilməzlər. Bir çox Quran ayələrində bu məsələyə işarə olunmuşdur. Halbuki müşriklər inanırlar ki, bütlər şəfaətdə ixtiyar sahibidirlər və .Allahdan asılılıqları yoxdur

Şəfaətdən danışarkən deyəcəyik ki, düzgün şəfaət Allah tərəfindən şəfaətdir. Bəzi :dualarda Allahdan istəyirik ki, Allah məsum imamları bizim şəfaətçimiz qərar versin

و شفعهم فی جمیع ما سئلتک

".Onları Səndən bütün istəklərimizdə şəfaətçi qərar ver"

Bu iki növ şəfaət arasında başqa bir (üçüncü) fərq budur ki, bütpərəstlərin şəfaətçiləri heç bir hissə, hərəkətə, şüura malik olmayan mücəssəmə şəklində qızıl-gümüş, taxta və daşdır. Müsəlmanların şəfaətçiləri (vasitəçiləri) isə kamil insanlar, Allah dərgahına yaxın adamlar, Allah yanında ən uca məqama malik və xalis bəndələrdir. Onları .bütlərlə, daş və taxta ilə müqayisə etmək yersizdir

Dördüncü fərq budur ki, şəfaət olunanlar xüsusi səciyyələrə malikdir və onlarda şəfaət ləyaqəti var. Ancaq şəfaət olunan müşriklər üçün heç bir qeyd-şərt zikr edilməmiş, ".yalnız ümumi sözlər deyilmişdir: "Bütlər bizim Allah dərgahındakı şəfaətçilərimizdir

## HƏDİSDƏ ALLAHDAN QEYRİSİNDƏN İSTƏK HAQQINDA

Vəhhabilərin peyğəmbər və övliyalardan kömək istəməklə bağlı iradlarına işarə etdik və onları cavablandırdıq. İndi isə bu mövzuda Rəsulullahdan (s) nəql olunmuş .hədislərə nəzər salırıq

Xülasətul-kəlam" kitabında İbnus-Sunnidən, o da Abdullah ibn Məsuddan nəql edir."-١ :O deyir

قال رسول الله ؐ، اذا انقلتت دابه احدکم بارض فلاه فلیناد یا عباد الله! أحبسوا فان الله عبادا یجیبونه

Peyğəmbər (s) buyurub: Əgər sizlərdən birinin heyvanı çöllükdə əlindən hürküb" qaçsa, belə nida etsin: "Ey Allah bəndələri! Onu saxlayın." Çünki Allahın ona cavab (verəcək bəndələri var." (١

:Təbəraninin nəql etdiyi başqa bir rəvayətdə Rəsulullah (s) buyurur



---

.Kənzul-Ummal", ۶-cı cild, səh. ٧٠۵" . [١] -١

اذا اضل احدكم شيئا او اراد عونا بارض ليس فيها انيس فليقل يا عباد الله! أعينونى

Əgər sizlərdən biri bir şey itirsə, ya heç bir şəxsin olmadığı yerdə kömək istəsə belə" desin: Ey Allahın bəndələri! Mənə kömək edin." (١)

Başqa bir rəvayətdə (اغيثونى) sözünün əvəzinə (əğiysuni) أعينونى (əiynuni) kəlməsi nəql olunmuşdur. Onun mənası kömək tələb etməkdir.

فان الله عبادا لا ترونهم

"Şübhəsiz Allahın sizin görmədiyiniz bəndələri vardır." (٢)

Deməli, Allahdan qeyrisindən kömək istəmək və kömək tələb etmək caiz və şəridir. Rəsulullah (s) bu barədə göstəriş vermiş, fəqihlər bu hədisləri səfərə çıxmaq qaydalarında nəql etmişlər.

٢- Həmçinin "Xülasətul-Kəlam" kitabında Bilaldan səhih sənədlə nəql olunmuşdur ki, İbn Haris (rəziyəllahu ənhu) qıtlıq ilində bir qoyun kəsdi. Onun arığ və ətsiz olduğunu görüb fəryad çəkdi: "Ya Məhəmməd! Ya Məhəmməd!" O bu çağırışla Peyğəmbərdən (s) kömək istəyirdi. (٣)

٣- Yenə də "Xülasətul-Kəlam" kitabında deyilir ki, Rəsulullahın (s) səhabələri Museyləmə Kəzzabla döyüşən zaman şüar bu idi: "Ya Məhəmməd!" Bu şüarla onlar Rəsulullahdan (s) kömək tələb edirdilər. (٤)

٤- Qazi Əyaz nəql edir ki, Abdulla ibn Ömərin ayağı burxuldu və gücdən düşdü. Ona dedilər: "Daha çox sevdiyin insanı yadına sal." O dedi: "Ya Məhəmməd!"



---

١- [١]. "Məcməuz-Zəvaid və Mənbəul-fəvaid", ١٠-cu cild, səh. ١٣٢; "Məcməul-Kəbir", ١٧-ci cild, səh. ١١٧ və ١١٨.

٢- [٢]. "Kəşful-İrtiyab", səh. ٢٥٠.

٣- [٣]. Həmin mənbə, səh. ٢٥٠ və ٢٥١.

٤- [٤]. Həmin mənbə.

(Bunun özü də bir növ kömək diləməkdir.(١

Səvad ibn Qarib Rəsulullah (s) barədə bir qəsidə yazmışdır. Təbərani onu "Camii-ə Kəbir"də nəql etmişdir. Həmin qəsidə Peyğəmbərə (s) təvəssül etmək və ondan :kömək diləmək barədədir. O belədir

و اشهد ان الله لا رب غيره

و انک مأمون على کل غائب

و انک أدنى المرسلين وسيله

الى الله يابن الأکرمين الأطائب

فمرنا بما يأتيک يا خير مرسل

و ان کان فيما فيه شيب الذوائب

و کن لى شفيعا يوم لا ذو شفاعه

بمغن فتيلا عن سواد بن قارب

Şəhadət verirəm ki, Allahdan başqa Pəbb yoxdur. Sən hər bir gizlin olana əmin və" .şahidsən

Sən peyğəmbərlərdən Allaha daha yaxın olanısan, bir vasitəsən, ey əziz və pak !şəxslərin övladı

Sənə çatan şeylərdən bizə əmr et, ey göndərilmişlərin daha yaxşısı! Bu əmrə və !fərmana əməl etmək saçların ağarmasına səbəb olsa da belə

Şəfaətçilərin şəfaətinin xurmanın sapı (yaxud pərdəsi) qədər Savad ibn Qaribə faydası ".olmadığı gün mənə şəfaətçi ol

O bu qəsidədə Peyğəmbərdən (s) şəfaət istəmiş və o həzrətə (s) həyatda olan halda təvəssül etmişdir. Nə Rəsulullah (s) , nə də müsəlmanlar tərəfindən ona heç bir irad tutulmamışdır. Peyğəmbər (s) də öz sükutu ilə onun şəfaət tələbini və təvəssülünü

(təsdiqləmişdir.(۲

Bir ərəb Rəsulullah (s) həyatda olduğu zaman onun-۶

səh:۷۸

---

.Həmin mənbə .[۱]-۱

Kəşful-İrtiyab", səh. ۳۱۰-dan və "Ayini vəhhabiyyət", səh. ۱۶۳-dən nəqlə" . [۲] -۲ .əsasən

hüzuruna gəlib dedi: "Biz nalə çəkən dəvəmiz və çağıran uşağımız olmayan halda ".sənin yanına gəlmişik

:Sonra bu şeri oxudu

أتيناك و العذراء تدمى لبانها

و قد شغلت ام الصبى عن الطفل

و لا شىء مما يأكل الناس عندنا

سوى الحنظل العامى و العلهز الفسل

و ليس لنا الا اليك فرارنا

و اين فرار الناس الا الى الرسول

Biz sənin yanına gəlmişik bir halda ki, atların sinəsindən qan axır və ana öz" .körpəsindən ayrılmışdır

Yemək üçün qıtlıq ilində yeyilən hənzələdən (acı otdan), dəri və qandan başqa bir .şeyimiz yoxdur

Bizim sənə pənah gətirməkdən başqa çarəmiz yoxdur. İnsanlar peyğəmbərlərdən "!?başqa hara pənah apara bilərlər

Sonra Rəsulullah (s) ayağa qalxdı. Mübarək əbası yerlə sürünən halda gedib minbərə ".çıxdı və əllərini göyə qaldırıb dua etdi: "Pərvərdigara! Bizi bol yağışla sirab et

O həzrət (ə) əllərini aşağı endirənədək yağış yağmağa başladı. Bu zaman Peyğəmbər (s) buyurdu: "Allah Əbu Talibə xeyir versin! Əgər o sağ qalsaydı, gözlərinə işıq gələrdi. Kim bizim üçün onun şerini oxuya bilər?" Əli ibn Əbi Talib (ə) ayağa qalxdı və dedi: "Ey :Allahın Rəsulu! Yəqin ki, Əbu Talibin bu sözlərini buyurursan? O demişdir

Üzü ağ(ləyaqətli) bir şəxsin ehtiramına buludlar yağışyağdırar. O yetimlərin sığınacağı" və dul qadınları qoruyandır. Haşim övladlarından çətinliyə düşənlər onun ətrafına .yığışar, onun yanında nemət və bəxşiş içində olarlar

(Peyğəmbər (s) buyurdu: "Bəli. (Mənim məqsədim həmin bu beytlər idi.)" (۱)



---

.Şərhi İbn Əbil-Hədid, ۱۴-cü cild, səh. ۸۰ və ۸۱ . [۱] -۱

Əli (ə) Əbi Talibdən olan qəsidəni oxudu və Rəsulullah (s) minbərdə onun üçün bağışlanma dilədi. Sonra Kənanə tayfasından bir kişi ayağa qalxdı və Peyğəmbərin (s) (mədhində və ona təvəssül barədə şerlər oxudu.(۱



---

Həmin mənbə; Sireyi Hələbinin haşiyəsində Sireyi Əhməd ibn Dəhlan, ۱-ci cild, . [۱] -۱ .səh. ۸۲-də Beyhəqidən və o Ənəsdən nəql edib

## DUADA PEYĞƏMBƏRLƏRƏ VƏ İLAHİ ÖVLİYALARA TƏVƏSSÜL

**İşarə**

Vəhhabilərin şirk bildikləri əməllərdən biri də peyğəmbər və ilahi övliyalara təvəssül, yəni insanın duada və Allaha müraciətdə peyğəmbər və övliyaları vasitə qərar :verməsidir. Təvəssül bir neçə şəkildə yerinə yetə bilər

:Onların zatına təvəssül etmək. Məsələn belə desin-١

İlahi! Sənin peyğəmbərin Məhəmmədin (s) vasitəsilə sənə təvəssül edirəm ki, mənim" ".istəkimi yerinə yetirəsən

:Onların məqam və əzəmətinə təvəssül etmək. Məsələn belə deyilsin-٢

İlahi! Məhəmmədin (s) hörməti, əzəməti və məqamına təvəssül edirəm ki, mənim ".istəyimi qəbul edəsən

(Ətəvəccəhu bihi iləykə) "اتوجه به اليک" :Belə deyilir-٣

".Sənə onun vasitəsi ilə təvəssül edirəm"

(Uqəddimuhu bəynə yədəy istəki) "اقدمه بين يدى حاجتى" :Belə deyilir-۴

".Öz istəyimin önündə onu qərar verirəm"

Belə desin: "İlahi! Səni and verirəm Məhəmməd və Ali Məhəmmədin haqqına ki,-۵ mənim istəklərimi qəbul edəsən". Bütün bunlar onu bildirir ki, insan Peyğəmbəri (s), övliya və məsum imamlardan birini özü ilə Allah arasında vasitəçi qərar verir və Allahdan istəyir ki, onların

xatirinə istəkləri yerinə yetsin. İbn Teymiyyənin və vəhhabilərin nəzərincə, Allahdan başqalarını hər hansı bir şəkildə vasitə qərar vermək haramdır, hətta şirkə səbəb olur. Onlar təvəssülü bir növ şəfaət istəyi bilir və şəfaəti haram, şirkin iş növlərindən hesab .edirlər

:Ət-Tovhid" kitabında Məhəmməd ibn Əbdül-Vəhhabdan belə nəql olunmuşdur"

أولئك الذين يدعون يبتغون الى ربهم الوسيله ايهم أقرب . . .

O "Onların tapındıqları tanrıların özlərindən hər hansı biri (Allah dərgahına) daha yaxın olsun deyə, Rəbbinə vəsitə axtarır, Onun rəhmətini umur, əzabından qorxur" (۱)- ayəsini zikr etdikdən sonra deyir ki, bu ayə saleh şəxsləri çağıran müşrikləri rədd edir (və bunun daha böyük şirk olması bəyan olunur.(۲

Təthirul-etiqad" kitabında Sənanidən nəql olunmuşdur: "Hər şəxs bir məxluqa" təvəssül etsə, Allahdan qeyrisini Ona şərik qoşmuşdur və onun halal olmayan bir şeyə (etiqadı müşriklərin bütlərə etiqadı kimi olmuşdur." (۳

Həmçinin, məxluqa (yaradılmışlara) təvəssül etməyi küfr və şirkə səbəb olan (ibadətlərdən hesab etmişdir.(۴

İbn Teymiyyə "Ziyarətul-qubur" risaləsində deyir: "Filan şəxsin məqamına xatir, ya filan şəxsin bərəkətinə xatir, ya da filan şəxsin Sənin (Allahın) yanında olan hörmətinə xatir, mənim üçün filan işi yerinə yetir" – sözlərini çoxları deyir. Lakin səhabələrdən, onlara tabe olanlardan və ümmətin qədim adamlarından kimsə belə dua etməmişdir. Bu barədə üləmadan bir şey



---

.İsra surəsi, ayə ۵۷ . [۱]-۱

.Kəşful-İrtiyab", səh. ۲۵۱" . [۲]-۲

.Həmin mənbə, səh. ۲۵۱ və ۲۵۲ . [۳]-۳

.Həmin mənbə . [۴]-۴

nəqlolunmayıb. Ancaq fəqih alim Əbi Məhəmməd ibn Əbdüs-Səlamın fitvalarında bu işin caiz (halal) olmadığını görmüşəm. Əgər Peyğəmbərdən nəql olunmuş hədis ".düzgün olsa, bu iş yalnız onun barəsində caizdir

Sonra o "Sunənun-Nəsai" və İbn Macədən bir neçə hədis nəql edir. Biz sonralar ona işarə edəcəyik. Daha sonra deyir: "Bəziləri deyirlər ki, bu hədislərdə Peyğəmbərə (s) təvəssülün caizliyi onun ölümündən sonrakı hala aid deyil. Bu hədislər o həzrətin (s) ".hüzuru olan zamana məxsusdur

Sonra deyir: "Üləmadan heç biri deməmişdir ki, Peyğəmbərə (s), saleh bəndələrə (onların ölümündən sonra təvəssül etmək caiz və şəridir." (١)

**?TƏVƏSSÜL NƏDİR**

Təvəssül" bütün adi və qeyri-adi səbəblərdən istifadə etməklə məqsədə çatmaq" üçün bir şeyi və ya bir şəxsi vasitə seçmək mənasındadır. Amma söhbətimizdə təvəssül dedikdə Allah yanında hörmətə malik bir şəxsi vasitə və şəfaətçi seçmək, onun vasitəsilə qüdrət sahiblərinin köməyinə nail olmaq nəzərdə tutulur. Bu iki növdür: Biri budur ki, vasitə olan şəxsə müraciət edib ondan şəfaət və vasitəçilik xahiş edilsin. Bir çox vasitəçiliklər belədir. İlahi övliyalara təvəssül edib kömək diləmək, onlardan şəfaət tələb etmək həmin növdəndir. Yəni onlardan istənilir ki, Allahdan bizim çətinliklərimizin həlli edilməsini diləsinlər. Bu nöqtə ilahi övliyalardan kömək istəmək bəhsində araşdırıldı və günahlar üçün şəfaət tələb etmək bəhsində müzakirə .olunacaq

İkinci növ budur ki, bir şəxs öz istəyini birbaşa Allaha ərz edir. Lakin həmin vasitənin (məqam və hörmətini qeyd edir. Misal üçün deyir: "Pərvərdigara! Rəsulullahın (s



---

.Həmin mənbə .[١]-١

məqam və hörmətinə xatir mənim istəyimi yerinə yetir". Haqqında bəhs olunan mövzu .həmin ikinci qismdəndir

Vəhhabilər bu hissəni də şirk, ya da qeyri-şəri bilirlər. Bəziləri də onu yalnız Peyğəmbərin (s) barəsində caiz sayırlar. Əlbəttə, bu barədə nəql olunmuş hədisin düzgünlüyünü şübhə altına alırlar. Bəziləri də onu Peyğəmbərin həyatda olduğu dövrdə işlək bilmiş və ölülər barədə qeyri-caiz saymışdır. Mövzunun aydınlaşması üçün onu iki hissədə və iki cəhətdən araşdırmaq lazım gəlir: ümumi qayda əsasında və .rəvayətlər baxımından

**Birinci hissə: Ümumi qayda**

Təvəssülün vəhhabilərin nəzərində şirk və küfrə səbəb olan hansı ünvana uyğun gəldiyini müəyyənləşdirməliyik. Peyğəmbər (s) və övliyalardan birinin hörmətini vasitə qərar vermək və ya Allahı onların məqam və hörmətinə and vermək həmin şəxsə ibadətdirmi? Doğrudanmı, bu Allahdan qeyrisini çağırmaq və ya Allahdan qeyrisinə ?dua etməkdir

Hər iki sualın cavabı mənfidir. Çünki burada vasitə ilə heç bir əlaqə yaranmır, bu iş onların qarşısında nə təzim, nə də çağırışdır. Ötən bəhslərdə araşdırdığımız birinci növlə bu iki təvəssül arasında fərq var. Birinci növlə bağlı iradlardan heç biri bu hissədəki təvəssülə aid edilə bilməz. Çünki bu hissədə Allahdan qeyrisindən deyil, Onun özündən kömək istənilir. Ondan istək tələb olunur və vasitəyə əsla xitab olunmur. İbn Teymiyyə "Ziyarətul-qubur" risaləsində Peyğəmbərdən (s) təvəssülün caiz olmasını göstərən hədisi nəql etdikdən sonra deyir: "Bir dəstə adam Peyğəmbərin həyatında və vəfatından sonra təvəssülün caiz olduğunu sübuta yetirmək üçün bu hədisi yada salır. Onlar demişlər: "Təvəssüldə məqsəd məxluqları (yaradılmışları) çağırmaq və məxluqlardan kömək diləmək deyil. Təvəssül Peyğəmbərin (s) məqamına ".(hörmətinə) təvəssül etməklə Allah-taaladan kömək diləmək və dua etməkdir

İbn Teymiyyə bu sözlərin şirkə səbəb olduğunu demir. Amma sözünün axırında: "Bu təvəssül Peyğəmbərin (s) hüzuru və həyatda olduğu vaxta məxsusdur", – söyləyir.

Sonra əlavə edir: "Bu hədisdə o Həzrətin (s) vəfatından sonra ona təvəssül etməyin caiz olduğunu göstərən bir şey yoxdur. Bu təvəssül yalnız o həzrətin (s) hüzuru və həyatı dövrünə məxsusdur."

Daha sonra deyir: "Müsəlmanlar o həzrət (s) həyatda olan zaman ona təvəssül edirdilər. Ancaq ölümündən sonra nə o həzrətin (s), nə də başqalarının qəbri yanına gedib onlara təvəssül etmirdilər." (١)

Rəvayətlərdən danışanda bu hədislərə, o Həzrətin (s) həyatı ilə ölümü arasında fərq olub-olmamasına işarə edəcəyik. İbn Teymiyyə özü də bu hədisi elə bir tayfadan nəql edib ki, onların nəzərində təvəssül məxluqlar üçün dua və onlardan kömək diləmək deyildir. Zahirən o özü də bu mətləbi qəbul edir. Çünki buna irad tutmamışdır.

Bununla belə həmin risalənin başqa bir yerində yazır: "Əgər bir şəxs Allaha böyük bir şəxsə, padşaha onun xüsusi adamları və köməkçiləri vasitəsilə yaxınlaşdıqı kimi təvəssül etsə, bu kafirlərin və müşriklərin əməllərindən sayılar."

İbn Teymiyyənin məqsədi təvəssülün birinci növü də ola bilər. Çünki bu növ təvəssülə aid xüsusiyyətləri müzakirə etmişlər. "Əl-Hədiyyətul-sunniyyə" rəsailinin ikinci risaləsində deyir: "Təvəssül odur ki, bir şəxs desin: Pərvərdigara! Sənin peyğəmbərin Məhəmmədin (s) məqamına (vasitəsilə) xatir (ya peyğəmbərinin haqqına, ya saleh bəndələrinin məqamına , ya filan bəndənin haqqına) Sənin dərgahına təvəssül edirəm... Bu növ təvəssül məzəmmət olunmuş bidət növlərindəndir və onun düzgün olmasına heç bir dəlil yoxdur. Məsələn, azanda Peyğəmbərə (s) salavat



---

١- [١] . Həmin mənbə.

".deyən zaman səsi ucaltmaq kimi. Buna aid dəlil yoxdur

Bu kəlamda təvəssülü bidət adlandırmış, bu barədə heç bir dəlil olmadığından onu şirk .saymışdır

Hədiyyətul-sunniyyə" rəsailinin birinci risaləsində deyir: "Allah-taalaya ixtilaflı" vasitələrlə təvəssül etmək məkruhdur, yoxsa haram? Daha məşhur nəzər haramdır." ((١

.Bu münasibətdə də küfr və şirkdən əsla bir söz yoxdur

Yenə də "Hədiyyətus-sunniyyə" rəsailinin birinci risaləsində deyilir: "Allahı bir məxluquna and vermək, üləmanın hamısının nəzərincə, rədd olunub. Bu qadağanın "tənzihi" (pak edən), ya "təhrimi" (haram edən) qadağa olması barədə iki nəzər var. Düzgün nəzər budur ki, o təhrimi qadağadır. Bu nəzəri Əziz ibn Əbdüssəlam öz fitvalarında bəyan etmişdir. Sonra Əbu Hənifədən nəql edir ki, o demişdir: Bir şəxsin Allahı Onun özündən başqa bir vasitə ilə çağırması düzgün deyil. Məkruh bilirəm ki, :deyə

بمعاقد العز من عرشك

".Bi məaqidil-izzi min ərşik"

Yaxud

بحق خلقك

".Bi həqqi xəlqik"

Əbi Yusifdən nəql olunub ki, "Bi məaqidil-izzi min ərşik" həmin Allahdır. Mən bunu :məkruh bilmirəm. Məkruh bildiyim şey odur ki, desin

Səni and verirəm filan şəxsin haqqına, ya da Səni and verirəm peyğəmbərlərinin" ".haqqına

Qəduridən nəql edir ki, məxluqun haqqına xatir bir şey istəmək caiz deyil. Çünki

(məxluqun Xaliqin (yaradanın) öhdəsində haqqı yoxdur." (۲)

Deməmk, onlar bu növ təvəssülü şirk bilməmişlər. Çünki şirk üçün sadalanan şərtlər bu növ təvəssüldə



---

۱- [۱] . ۲۶۳ .Həmin mənbə, səh

۲- [۲] . ۲۶۴ .Həmin mənbə, səh

yoxdur. Əgər mütləq halda təvəssülü şirk bilmişlərsə, birinci növə aid fitvanı əsas götürmüşlər. Onun haram və məkruh olmasında da ixtilaf var. Onu haram bilənlərin dəlili budur ki, caiz olmasına dair rəvayət yoxdursa, demək, bidət və qeyri-caizdir.

Cavab olaraq deyirik:

١. Ötən bəhslərdə deyildi ki, bir şeyin caiz olmasına şəkk varsa, burada mübahlıq əsas götürülür və haramlığa dəlil olmayanda mübahlıq hökmü vermək üçün bu kifayət edir. Haramlığa fitva üçün dəlil gərəkdir.

٢. Duanın dəlilləri (qeyd və şərtsiz bəyan olunmuş dəlillər) ona da şamil olunur. Çünki bu bir növ Allaha dua və ibadətdir. Təvəssülə ayrıca dəlil göstərilməsinə zərurət yoxdur.

٣. İkinci hissədə bu növ təvəssülün müstəhəb olmasına bir neçə dəlil göstərəcəyik.

**İkinci hissə: Rəvayətdə təvəssülün caiz olması**

Rəvayətlər və tarixi mənbələrdə Allahı övliyaya və peyğəmbərlərə, onların məqamlarına and verməklə bağlı bir çox nümunələr var. Onları bir neçə qrupa bölmək olar:

a) Saleh əməllərə təvəssül;

b) Yağış tələb etmək üçün peyğəmbərlərin əhli-beytinə (ə) təvəssül;

v) Beş məsumun yaranışdan qabaqkı vücuduna təvəssül;

q) Peyğəmbərə (s) həyatda olduğu dövrdə təvəssül;

ğ) Peyğəmbərə (s) vəfatından sonra təvəssül;

d) Mələklərə təvəssül;

j) Saleh bəndələrə təvəssül

**a) Saleh əməllərə təvəssül**

Ata-anasına yaxşılıq etmiş bir şəxsin duasının qəbul olması barədə Rəsulullahdan (s)-١
rəvayət olunmuşdur: "Üç

nəfər yolda gedərkən onları yağış tutdu. Onlar bir mağaraya daxil oldular. Birdən dağın başından bir qaya parçası düşüb, mağaranın yolunu bağladı. Onlar bir-birlərinə dedilər: Hər şəxsin əgər saleh bir əməli varsa, onu nəzərdə tutub, Allahı o saleh əməllə çağırsın ki, Allah bizə bir yol açsın. Onlardan biri dedi: "İlahi! Mənim öhdəmdə qoca ata-anam və körpə uşaqlarım var. Mən onlar üçün süd hazırlayır, öz uşaqlarımdan qabaq onlara içirirəm. Yolun uzaqlığına görə bir gün evə gec gəldim və gördüm ki, ata-anam yatmişdir. Bir kasa süd əlimdə onların başı üstündə dayandım. Onları yuxudan oyatmaq, həmçinin onlardan qabaq uşaqlarıma süd vermək istəmədim. Bu mənim adətim deyil ki, ata-anadan qabaq onlara yemək verəm. Səhərədək səbr etdim (və ata-anam yuxudan oyandılar). Pərvərdigara! Əgər mən bu əməli Sənə xatir etmişəmsə, bizə bir yol aç! (bizi bu mağaradan qurtar!)" Allah mağaraya işıq düşəcək .qədər yol açdı

İkinci adam dedi: "Pərvərdigara! Həddindən artıq sevdiyim bir əmim qızı vardı. Onunla yaxınlıq etmək istədim. Ancaq o bu iş müqabilində yüz dinar istədi. Mən çox çalışdım və yüz dinar hazır etdim. Onunla görüşdük. Yaxınlaşmaq istəyəndə dedi: "Ey Allah bəndəsi! Allahdan qorx..." ( günah iş görmə) Mən ayağa qalxıb oradan uzaqlaşdım. Pərvərdigara! Əgər mən o əməldən Sənə xatir çəkinmişəmsə, bizim üçün bir yol aç. .Allah-taala mağaraya açılmış yolu genişləndirdi

Üçüncü adam dedi: "Pərvərdigara! Mən düyü təmizləmək üçün bir şəxsi muzdla işçi tutdum və o işi qurtarıb haqqını istədi. Mən onun haqqını verdim. Ancaq o haqqını almayıb narazı halda getdi. Mən ona çatacaq pulla əkin əkdim və qazancına inək alıb, çoban tutdum. Bir müddət sonra həmin şəxs yanıma gəlib haqqını istədi. Dedim: " Bu inək, bu da çoban." O dedi: "Allahdan qorx və məni ələ salma!" Dedim: "Səni ələ salmıram. Bunların hər ikisi sənin ixtiyarındadır." O şəxs haqqını alıb getdi. Pərvərdigara! Əgər mən bunu sənə xatir etmişəmsə, bizim

üçün bir çıxış yolu göstər." Allah-taala onlar üçün yol açdı və onlar mağaradan çıxdılar.(1)

Durrul-Mənsur" təfsirində "Yoxsa Əshabi-Kəhfin və Rəqimin (mağarada Rəqim" əhlinin) ayələrimizdən əcaib bir şey olduğunu güman edirsən? (Xeyr, bu Bizim qüdrətimiz qarşısında adi bir işdir!)" (2) ayəsinin ardınca haqqında danışılan dastan azca fərqlə, dörd vasitə ilə Rəsulullahdan (s) nəql edilmişdir:

1- Əbd ibn Həmiddən, İbn Munzirdən, İbn Əbi Hatəmdən, Təbəranidən, İbn Murdəvəyhdən, Numan ibn Bəşirdən və o da Rəsulullahdan (s).

2- Əhməddən, İbn Munzirdən, Ənəsdən və o da Peyğəmbərdən (s).

3- Buxari, Müslim, Nəsai və İbn Munzir İbn Ömərdən, o da Rəsulullahdan (s).

4- Buxari öz tarixində İbn Abbasdan, o da Rəsulullahdan (s).(3)

Şiə kitablarında bu əhvalat azca fərqlə nəql olunmuşdur. O cümlədən, Məhasini Bərqidə Əbdürrəhman ibn Əbi Nəcrandan, o da Mufəzzəl ibn Salehdən, o da Cabir Cufidən, o da Rəsulullahdan (s).(4)

Deməl, hədis səhihdir və Allahın razılığı üçün yerinə yetirilmiş hər növ saleh və xalis əmələ, o cümlədən şəhidlərin və məzlumların fədakarlığına təvəssül etmək caizdir.

2- Ətiyyə Ovfi Əbu Səid Xidridən nəql edir ki, Peyğəmbər (s) buyurub: Hər şəxs namaz qılmaq üçün evindən çıxan zaman bu duanı oxusa, Allahın rəhməti ilə üzləşər və min mələk onun üçün bağışlanma diləyər. O dua belədir:

اللهم انی أسئلک بحق السائلین علیک و أسئلک بحق ممشای هذا فانی لم أخرج اشرا و لا بطرا و لا ریاء و لا سمعه و خرجت اتقاء سخطک و

səh:89

---

1- [1]. "Səhih i- Buxari", 8-ci cild, səh. 4.

2- [2]. "Kəhf" surəsi, ayə 9.

3- [3]. "Əd-Durrul-Mənsur", 4-cü cild, səh. 212 və 213. "Kəhf" surəsinin təfsiri.

ابتغاء مرضاتک فاسألک ان تعیذنی من النار و ان تغفر لی ذنوبی انه لا یغفر الذنوب الا أنت

Pərvərdigara! Sənin dərgahından istəyənlərin və Sənə tərəf atdığım addımların" hörmətinə xatir Səndən istəyirəm. Çünki mən Sənə itaətsizlik, xoşgüzəranlıq, ya dildə və əməldə riyakarlıq üçün yox, Sənin qəhr-qəzəbindən çəkinmək və razılığını qazanmaq üçün evimdən çıxmışam. Səndən istəyirəm ki, məni cəhənnəm odundan qoruyasan və güzəşt edib günahlarımı bağışlayasan. Çünki günahları Səndən başqa bağışlayan bir şəxs yoxdur." (۱)

Bu hədis ilahi dərgahdan istəklərin, saleh və xalis əməl haqqına təvəssülün caiz olduğunu göstərir. Bu hədisdə iki şeyə təvəssül etmək əmr olunmuşdur: saleh bəndələrə və ilahi dərgahdan istəyənlərin məqamına. Bu mövzuda öncə danışıldı. İkinci təvəssül yalnız Allahın razılığı üçün edilmiş xalis bir əməlin haqqına xatir təvəssüldür. İndi bu barədə danışacağıq.

Peyğəmbərdən (s) nəql olunan hədisə əsasən, Allahın razılığı üçün edilmiş xalis əmələ təvəssül müstəhəbdir.

### b) Yağış tələbi ilə peyğəmbər əhli–beytinə (ə) təvəssül etmə

Qəstəlani "Şərhi-Buxari"də Kəbul Əhbardan nəql edir ki, Bəni-İsrail qıtlıq və quraqlıq illərində yağış tələb etmək üçün öz peyğəmbərlərinin əhli-beytinə təvəssül edər və Allahı peyğəmbər əhli-beyti vasitəsilə çağırardı. (۲)

### Yaradılışlarından öncə beş məsuma (ə) təvəssül

səh:۹۰

---

۱- [۱] . "Sunəni İbn Macə", ۱-ci cild, səh. ۲۵۶, ۷۷۸-ci hədis, "Kitabul-məsacid", babul-məşy iləs-səlat; "Musnəd Əhməd ibn Hənbəl", ۳-cü cild, səh. ۲۱.

۲- [۲] . "Kəşful-İrtiyab", səh. ۲۵۳.

TƏVƏSSÜL

Hakim Nişapuri "Müstədrək" kitabında, Beyhəqi "Dəlailun-Nubuvvət" kitabında, İbn Əsakir öz tarixində, Süyuti "Durrul-Mənsur"da və Alusi "Ruhul-Məani"də Ömər ibn Xəttabdan nəql etmişlər ki, Peyğəmbər (s) buyurub: "Adəm günah edəndən sonra başını göyə tərəf qaldırdı və ərz etdi: "Pərvərdigara! Məhəmmədin (s) haqqına xatir Səndən istəyirəm ki, mənim günahımı bağışlayasan." Allah ona vəhy etdi: "Məhəmməd (s) kimdir? (nəql olunmuş bəzi hədislərdə Allah buyurur: Məhəmmədi necə tanıdın, axı onu hələ yaratmamışam?)" Adəm dedi: "Məni öz əlinlə yaradıb, bədənimə öz ruhundan üfürəndə başımı ərşə tərəf qaldırdım. Gördüm ki, ərşdə yazılıb: "Allahdan başqa heç bir məbud yoxdur və Məhəmməd (s) Allahın rəsuludur." Onda öz-özümə dedim ki, Sənin yanında məqam və hörmət cəhətindən Məhəmməddən (s) böyük şəxs yoxdur. Onun adını öz adının yanında yazmısan." Sonra Allah Adəmə vəhy etdi ki, o sənin zürriyyətindən olan peyğəmbərlərin ən axırıncısıdır. Əgər o olmasaydı, səni (yaratmazdım." (١)

Nəql olunmuş hədislərin bəzisində deyilir: "Düz deyirsən, ey Adəm! O Mənim üçün insanların ən sevimlisidir. Onun haqqına xatir Məndən istədiyin üçün səni bağışladım. ".Əgər Məhəmməd (s) olmasaydı, səni yaratmazdım

ŞAFEİNİN ƏHLİ-BEYTƏ (Ə) TƏVƏSSÜLÜ

İbn Həcər yazır: Şafei Əhli-beytə (ə) təvəssül etmək haqqında şerlər yazmışdır. Bu iki :beyt də onlardandır

آل النبی ذریتی

و هم الیه وسیلتی

أرجو بهم أعطى غدا



---

Əd-Durrul-Mənsur", ١-ci cild, səh. ١٤٢-də Təbəranidən, Hakimdən, Əbu Nəim" . [١] -١ İsfahanidən, Beyhəqidən və İbn Əsakirdən Şam tarixində nəql olunub; "Mustədrək",

.Al- Nəbi (Peyğəmbərin (s) Əhli-beyti) mənim Allaha olan vasitəmdir"

(Onlara ümidvaram ki, qiyamət günü mənim əməl naməm sağ əlimə verilər." (۱)

Bu iki beyt şer vəfatından sonra Peyğəmbərin (s) Əhli-beytinə təvəssüldür. "Əl-Ğədir" kitabı "Fəraidul-Səmtiyn"də Şeyxul-İslam Həmuqidən birinci babda Əbu Hüreyrədən nəql edir ki, Peyğəmbər (s) buyurub: "Allah Adəm Əbul-bəşəri (bəşərin atasını) yaratdı və öz ruhundan ona üfürdü. Sonra həzrət Adəm ərşin sağ tərəfinə baxdı. Birdən beş nurani simanın Allaha rüku və səcdə etdiyini gördü. Ərz etdi: "Məndən qabaq "?torpaqdan bir şəxs yaratmısanmı

"!Allah-taala buyurdu: "Yox, ey Adəm

"?Ərz etdi: "Bəs mənim şəklimdə olan bu beş şəxs kimdir

Allah buyurdu: "Onlar sənin övladlarındandır. Əgər onlar olmasaydılar, səni yaratmazdım. O beş nəfərin adı Mənim adımdan götürülmüşdür. Əgər onlar olmasaydılar cənnəti, cəhənnəmi, ərşi, sütunları, göyləri, yeri, mələkləri, ins və cini yaratmazdım. Mən Mahmudam, bu Məhəmməddir, Mən Aliyəm, bu Əlidir, Mən Fatirəm, bu Fatimədir, Mən Ehsanam, bu Həsəndir, Mən Möhsinəm, bu da Hüseyndir. And içirəm öz izzətimə! Hər şəxsin qəlbində onlara zərrə qədər kin və düşmənçilik olsa, onu cəhənnəmə daxil edərəm. Ey Adəm! Bunlar Mənim seçdiklərimdir, camaatın həlakı və nicat tapması onların vasitəsilə olacaq. Əgər Məndən bir şey istəyirsənsə, onlara ".təvəssül et

Peyğəmbər (s) buyurdu: "Biz nicat gəmisiyik. Hər şəxs bu gəmiyə minsə nicat tapacaq və hər şəxs o gəmidən kənarda qalsa, məhv olacaq. Allahdan kimin nə istəyi varsa, biz (Əhli-beytdən (ə) istəsinlər." (۲)

Bu hədisdə beş məsuma (ə) təvəssül Allah tərəfindən Adəmə əmr olunub, həm də Rəsulullahın (ə) kəlamında

".buyurulub: "Hər şəxsin Allahdan bir istəyi olsa, biz Əhli-beytin (ə) vasitəsilə istəsin

(Buna oxşar məzmunu Xarəzmi "Əl-Mənaqib" kitabında nəql etmişdir.(١

Hakim "Mustədrək" kitabında Rəsulullahdan (s) bir hədis nəql edir. O həzrət (s) buyurur: "Həzrət Adəm günahdan sonra ərz etdi: "İlahi! Səni and verirəm ".Məhəmmədin (s) haqqına, məni bağışla

Allah buyurdu: "Ey Adəm! Məhəmmədi (s) haradan tanıdın, axı hələ onu "!?yaratmamışam

Ərz etdi: "Məni öz qüdrətinlə yaradıb, öz ruhundan mənə üfürəndə başımı qaldırdım və gördüm ki, ərşin sütunlarında yazılıb: "La ilahə illəllah, Muhəmmədən rəsulullah" –başa ".düşdüm ki, Sən yaratdıqlarından ən sevimlisinin adını öz adına əlavə edərsən

Allah buyurdu: "Ey Adəm! Düz deyirsən. O mənim üçün yaratdıqlarımın ən sevimlisidir. Onun (Məhəmmədin) haqqına məni çağır ki, səni bağışlayım. Əgər Məhəmməd (olmasaydı, səni yaratmazdım." (٢

Əllamə Əmini yazır: Diyləmi "Musnədi firdovs"dan "Durrul-Mənsur"(٣) kitabında Əlidən (ə) olan sənədlə nəql edir. O həzrət (ə) buyurur: Peyğəmbərdən (s) "Adəm öz Pərvərdigarından bir neçə kəlmə öyrəndi və onların vasitəsilə tövbə etdi" sözləri barədə soruşdum. Həzrət (s) buyurdu: "Allah-taala Adəmi Hindistanda, Həvvanı Cəddədə yerə endirdi. Sonra Cəbraili onlara tərəf göndərdi və buyurdu: "Ey Adəm! Səni öz qüdrətimlə yaratmadımmı? Sənə öz ruhumdan üfürmədimmi? Sənə səcdəni mələklərimə vacib etmədimmi? Səni Həvva ilə evləndirmədimmi?" Adəm ərz etdi: "Bəli." Allah-taala buyurdu: "Bəs bu göz yaşları nə üçündür?" O ərz etdi: " Rəhman :Allahın dərgahından uzaqlaşdığım zaman necə ağlamayım?" Allah-taala buyurdu



---

.Əl-Mənaqib", səh. ٣١٨, ٣٢٠-ci hədis" . [١] -١

.Mustədrək", ٢-ci cild, səh. ٦١٥" . [٢] -٢

.ci cild, səh. ٦٠-١ . [٣] -٣

Sən bu kəlmələri öyrənməlisən ki, Allah tövbəni qəbul etsin və günahlarını bağışlasın." De: "İlahi! Səni and verib Məhəmməd və Ali-Məhəmmədin haqqına, Səndən istəyirəm. Sən pak və hər bir eybdən uzaqsan. Səndən başqa heç bir məbud yoxdur. Pis iş tutmuşam və öz nəfsimə zülm etmişəm. Məni bağışla. Sən bağışlayan və mehribansan." Bu, Adəmin Allahdan öyrəndiyi kəlmələrdir." (١)

İbn Nəccar İbn Abbasdan nəql edir: "Rəsulullahdan (s) Adəmin Allahdan öyrəndiyi və onun vasitəsilə tövbə etdiyi kəlmələr barədə soruşdum. Həzrət (s) buyurdu: "Adəm Allahı Məhəmmədin, Əlinin, Fatimənin, Həsən və Hüseynin haqqına and verib bağışlanma istədi. Allah da onun tövbəsini qəbul etdi." (٢)

Həmin əhvalatı fəqih alim İbn Muğazlı "Əl-Mənaqib" kitabında "Yənabiul-Məvəddət" kitabında olduğu kimi nəql etmişdir.(٣)

Həmçinin "Əl-Ğədir"də yazır: "Əbul-Fəth Məhəmməd ibn Əli Nətənzi (٤٨٠-cı il təvəllüdlü) "Xəsais" kitabında İbn Abbasdan nəql edir. O dedi: "Allah Adəmi yaradan zaman öz ruhundan ona üfürdü. Adəm asqırdı və dedi: "Əlhəmdulillah". Allah ona buyurdu: "Pərvərdigarın sənə rəhmət etsin." Mələklər ona səcdə edən zaman ərz etdi: "İlahi! Məndən çox sevdiyin bir şəxs yaratmısanmı?" Allah buyurdu: "Bəli. Əgər onlar olmasaydılar səni yaratmazdım." O ərz etdi: "Pərvərdigara! Onları mənə göstər." Bu zaman Allah vəhy hicabı mələklərinə buyurdu ki, hicabları qaldırsınlar. Hicablar qaldırılanda həzrət Adəm (ə) ərşdə beş nəfərin simasını gördü. Ərz etdi: "Pərvərdigara! Bunlar kimlərdirlər?" Allah buyurdu: "Ey Adəm! Bu peyğəmbərim Məhəmməd, bu peyğəmbərimin canişini və əmisi oğlu əmirəlmöminin Əli, bu peyğəmbərimin qızı Fatimə, bu iki nəfər də peyğəmbərimin övladları, Əlinin oğlanları Həsən və



---

١- [١] . "Əl-Ğədir", ٧-ci hədis, səh. ٣٠٠.

٢- [٢] . "Əl-Durrul-Mənsur", ١-ci cild, səh. ۶٠.

٣- [٣] . "Yənabiul-məvəddət", səh. ٢٣٩.

Hüseyndir". Sonra buyurdu: "Ey Adəm! Onlar sənin övladlarındırlar." Bu zaman Adəm sevindi. Günah edəndə ərz etdi: Pərvərdigara! Səni and verib Məhəmmədin, Əlinin, Fatimənin, Həsənin və Hüseynin haqqına, Səndən istəyirəm ki, məni bağışlayasan." Nəticədə Allah-taala onu bağışladı. Bu, Allah-taalanın Adəmə öyrətdiyi həmin .kəlmələrdir

Adəmin öz Pərvərdigarından öyrəndiyi kəlmələr budur: "İlahi! Səni and verirəm Məhəmmədin, Əlinin, Fatimənin, Həsənin və Hüseynin haqqına tövbəmi qəbul et." (Beləcə Allah-taala onun tövbəsini qəbul etdi." (١)

Bütün qeyd olunmuş hədislər "Mustədrək" kitabında səhih sayılsa da İbn Teymiyyə bunları yalan bilir və deyir: "Adəmin dastanında təvəssüllə bağlı zikr olunanların heç bir əsası yoxdur və heç bir şəxs onu Peyğəmbərdən (s) etimadlı bir sənədlə nəql (etməmişdir." Sonra iddia etmişdir ki, bu əhvalat yalandır." (٢)

Bu hədis şiənin təfsir və hədis kitablarında azacıq fərqlə nəql olunmuşdur. "Məcməul-Bəyan" və "Bürhan" təfsirində: "Adəm öz Rəbbindən bəzi xüsusi kəlmələr öyrənərək :tövbə etdi"(٣) – ayəsindən sonra deyilir

Adəm ərşdə təzim və hörmətlə bir neçə ad yazıldığını gördü. Adəm bu adlar barədə" soruşdu. Ona deyildi: Bu adlar Allahın ən sevimli məxluqlarının adıdır: Məhəmməd, Əli, Fatimə, Həsən və Hüseyn! Sonra Adəm



---

Əl-Ğədir" kitabında Ömər ibn Xəttabın Adəmin Peyğəmbərə (s) təvəssülü" . [١] -١ barəsindəki Rəsulullahdan (s) nəql etdiyi hədis aşağıdakı kitablarda gəlibdir: Beyhəqi "Dəlailun-nubuvvət"də, Hakim "Mustədrək"də (Əl-Ğədir, ٧-ci cild, səh. ٣٠١) onu səhih hədis bilmişdir. Təbərani "Əl-Mucəmul-Səğir"də, Əbu Nəim "Dəlailun-nubuvvət"də, İbn Əsakir "Əl-Xəsais"də və Səbki də onu "Şifaus-suqam"da səhih bilmişdir. Qəstəlani "Əl-məvahib"də, Səmhudi "Vəfaul-vəfa"da, Zərqani "Şərhul-məvahib"də, Əl-Uzzami ."Furqanul-Quran"da və Süyuti "Əl-Xəsaisul-Kubra"da bir dəstə ravidən zikr etmişdir

.Əl-Ğədir", ٧-ci cild, səh. ٣٠۴" . [٢] -٢

.Bəqərə surəsi, ayə ٣٧ . [٣] -٣

tövbəsinin qəbulu, məqamının ucalması üçün onların vasitəsilə Allaha təvəssül etdi." (۱)

Bu hədislərdən bir qismində deyilir ki, Adəm beş məsumun (s) nurlu simasına nəzər saldı. Bu hədislərə diqqət yetirdikdə ayənin təfsiri aydın olur. Əhli-sünnənin hədis kitablarında nəql olunmuş birinci rəvayətə əsasən, "kəlmələr"də məqsəd Peyğəmbərə (s) təvəssüldür. Şiə və əhli-sünnənin kitablarında nəql olunmuş hədislərə əsasən, həmin kəlmələrdə məqsəd beş məsumun siması , yaxud adlarıdır. Bu hədislər Adəmin İslam eyğəmbəri (s) yaradılmamışdan qabaq ona təvəssül etməsini isbat edir. Bu :təvəssül şairlər tərəfindən nəzmə çəkilmişdir. Məsələn, Vasiti deyir

به قد اجاب الله ادم اذ دعا

و نجی فی بطن السفینه نوح

قوم بهم غفرت خطیئه ادم

و هم الوسیله و النجوم الطلع

Allah onun vasitəsilə Adəmin duasını qəbul etdi və Nuha nicat verdi. Adəmin" günahının bağışlanmasında vasitə olan qövm Allah dərgahının vasitələri və parlayan ".ulduzlardırlar

**q) Peyğəmbərə (s) həyatda olduğu vaxt ona təvəssül**

Peyğəmbərə (s) həyatda olduğu vaxt təvəssül barədə rəvayətlər çoxdur. Burada :onlardan bəzilərinə işarə edəcəyik

:Birinci hədis

Osman ibn Huneyfdən nəql olunur ki, kor bir kişi Peyğəmbərin (s) hüzuruna gəlib ərz etdi: "Allahdan mənə şəfa istə." Peyğəmbər (s) buyurdu: "Əgər istəyirsənsə dua edim. Amma səbr etsən, daha yaxşıdır." Kişi dedi: "Dua et". Peyğəmbər (s) kişiyə buyurdu ki, dəstəmaz al və iki rəkət namaz qıl. Sonra belə dua et: "Pərvərdigara! Mən Səndən rəhmət peyğəmbərin Məhəmməd (s) vasitəsilə

istəyirəm. Ey Məhəmməd! Mən Allahdan istəyimin qəbul olması üçün sənin vasitənlə təvəssül edirəm. Pərvərdigara! Onun mənim barəmdə olan şəfaətini qəbul et və onu ".mənim şəfaətçim qərar ver

Osman ibn Huneyf deyir: And olsun Allaha! Söhbətimiz uzun çəkmədi. Biz dağılışmamışdan qabaq kişi bizim yanımıza heç vaxt kor olmamış vəziyyətdə daxil (oldu.(١

HƏDİSİN SƏNƏDİ BARƏDƏ SƏNƏD

Bu hədisin sənədinin düzgün olmasına irad yoxdur və bir çox mənbələrdə nəql :olunmuşdur. Onlardan bir hissəsinə işarə olunur

(Əhməd ibn Hənbəl Osman ibn Huneyfdən bu hədisi üç yolla nəql edir.(٢-١

:İbn Macə bu hədisi Osman ibn Huneyfdən və Əbu İshaqdan nəql etmiş və demişdir-٢

هذا حديث صحيح

(Bu düzgün hədisdir." (٣"

(Termizi bu hədisi nəql etmiş və onu səhih bilmişdir.(٤-٣

Ət-Tacul-Camiu lil-usuli fi əhadisir-rəsul" kitabı İbn Macədən başqa, beş səhih"-٤ kitabdan təşkil olunmuşdur. Bu hədisi Osman ibn Huneyf nəql etmiş, Allahı sevənlər vasitəsilə Allaha təvəssül etməyin caiz olması barədə bir bab açmış və təvəssülün caiz olması təsdiqləyən bir neçə rəvayət zikr etmişdir.(٥) "Ğayətul-məmul" ("Ət-Tacul-Cami"nin şərhi) kitabında hədisin səhih olduğunu qeyd edib deyir: "Bu səhih hədislər çətin anlarda saleh bəndələrə təvəssülün caiz



---

.Musnədi Əhməd ibn Hənbəl", ٤-cü cild, səh. ١٣٨, Osman ibn Huneyfin hədisi" . [١]-١

.Həmin mənbə . [٢]-٢

Sünəni İbn Macə", ١-ci cild, səh. ٤٤١, ١٣٨٥-ci hədis, "Babu ma caə fis-səlatil-" . [٣] -٣ ."hacəti

.Sünəni-Termizi", ۵-ci cild, səh. ۵۶۹, ۳۵۷۸-ci hədis, "Kitabud-dəəvat", ۱۱۹-cu bab" . [۴] -۴

Ət-Tacul-Camiu lil-usuli", ۱-ci cild, səh. ۳۱۹, "Kitabus-səlat", "yəcuzu" . [۵] -۵
."əttəvəssulu iləllahi bi əhibbaih

olduğunu, hətta zəruriliyini göstərir. Padşahlara onların çox sevdiyi şəxslər vasitəsilə yaxınlaşmaq üsulu da təvəssülün həqiqətindən danışır. Bundan qabaq qeyd etdik ki, mağaradakı insanlar öz əməlləri vasitəsilə Allaha təvəssül etdilər,(۱) Allah da onların təvəssülünə cavab verdi. Əgər saleh və yaxşı əmələ təvəssül isbat olunsa, saleh bəndələrə təvəssül daha yaxşı, daha fəzilətli olar. Onlar bütün saleh əməllərin mənbəyi, Allahın yerdə və göydə nəzərində olanlardırlar. Hədisi-qüdsidə Allah-taala .buyurur ki, Mən nə ərşimə, nə də yerə, ancaq mömin bəndənin qəlbində sığıram

Həqiqətə itaət məzhəbə(۲) itaətdən daha yaxşıdır. Deyilənlərdən əlavə, bu mövzuda (təvəssüldə) tədqiqat üçün xüsusi əsərlər var. O cümlədən, Əl-Əzhərin vəkili və Müahidin keçmiş müdiri Məhəmməd Hüseyn Əl-Udvanın əsərləri, böyük alim Şeyx .Yusif Əddəcvanın "Nurul-İslam" jurnalındakı fitvaları diqqəti cəlb edir

Hakim Nişapuri "Mustədrək"də bu hədisi nəql edib deyir: "Bu hədis düzdür, - ۵ (Şeyxeynin şərti ilə; yəni, Buxari və Səhihi Müslimin." (۳

.Beyhəqi bu hədisi nəql etmiş və onu səhih saymışdır-۶

Zəyni Dəhlan "Xülasətul-Kəlam"da yazır: "Bu hədisi Buxari öz tarixində, İbn Macə və-۷ ".Hakim "Mustədrək"də səhih sənədlə, Cəlaluddin Süyuti öz "Cami"sində nəql etmişlər

Vəhhabi məzhəbindən olan Rəfai "Əttəvəssul" kitabında yazır: "Bu hədis səhih və-۸ məşhurdur. Onu Nəsai, Beyhəqi, Termizi, Təbərani və Hakim "Mustədrək"də nəql ".etmişlər

Əl-Rəsailul-Hədiyyətul-Sunniyyə" kitabının birinci risaləsində bu hədis Termizidən,"-۹ .Hakimdən və İbn Macədən nəql edilmiş və onun səhih bir hədis olduğu vurğulanmışdır

Ziyarətul-qubur" risaləsində İbn Teymiyyə deyir: "Nəsai, Termizi və bu iki şəxsdən"-۱۰ başqaları



---

.Mağaradakı insanların saleh əməllərə təvəssülü bundan qabaq deyildi . [۱] -۱

Bu cümlədə məzhəb deməkdə məqsəd təvəssülü haram və qadağa etmiş . [۲] -۲

:rəvayət ediblər ki, Rəsulullah (s) öz səhabələrindan bəzisinə belə deməyi öyrədib

" . . . Əllahummə"

### ?HƏDİS NƏYİ SÜBUTA YETİRİR

Qeyd olunmuş hədis Rəsulullaha (s) təvəssülün müstəhəb olmasına dəlildir. Çünki .Peyğəmbər (s) onu görmə qabiliyyətinin bərpası üçün tövsiyə etmişdir

اللهم انی أسألك و أتوجه اليك بنبيك محمد نبی الرحمه

İlahi! Mən Səni çağırıram və Sənə rəhmət peyğəmbəri Məhəmmədin (s) vasitəsilə" ".yalvarıram

DeməK, həmin şəxs Peyğəmbərin (s) əmri ilə şəxsən Peyğəmbərin (s) özünə təvəssül .etmişdir

:Sonra Rəsulullahın (s) göstərişi və təlimi ilə Peyğəmbərə (s) xitabən deyir

يا محمد انی اتوجه بك الی ربی

".Mən onun vasitəsilə Allahıma təvəssül etdim"

O burada Rəsulullahın (s) öz şəxsini vasitə qərar vermişdir. Bütün bu cümlələrdə .təvəssül vasitəsi Peyğəmbərin (s) özüdür

Bu duanın bir neçə cümləsinə diqqət yetirdikdə aydın olur ki, məqsəd şəxsən :Peyğəmbərin (s) özünə təvəssüldür

;(نبيك محمد نبی الرحمه ) "a) "Nəbiyyukə Muhəmməd, nəbiyyur-rəhməti

يا محمد!) انی "b) Peyğəmbərə (s) xitab: "Ya Muhəmməd! İnni ətəvəccəhu bikə ila Rəbbi (اتوجه الی ربی

".Sənin vasitənlə Allaha üz tutmuşam"

(و شفعه فی) "v) "Və şəffihu fiyyə

"(.İlahi! Onu mənə şəfaətçi qərar ver. (Onun mənim haqqımdakı şəfaətini qəbul et"

Bu cümlədə də məqsəd şəxsən Peyğəmbərin (s) özüdür. Dua edən şəxs Allahdan istəyir ki, onu vasitə, şəfaətçi qərar versin. "Əttəvəssulu ila həqiqətit-təvəssul" kitabınının

səh:٩٩

müəllifinin dedikləri: "Bu duada məqsəd Rəsulullahın (s) şəxsən özünə yox, onun ."duasına təvəssüldür

Müəllifin göstərdiyi dəlil budur ki, Rəsulullah (s) kor şəxsin cavabında buyurdu: "Əgər ".istəyirsənsə dua edim, istəyirsənsə səbr et. Səbr sənin üçün daha yaxşıdır

Amma kor kişi dua istədi. Rəsulullahın (s) buyurduğu duadan sonrakı cümlə də bunu :təsdiq edir

".Pərvərdigara! Onu mənim üçün şəfaətçi qərar ver"

Demək, burada məqsəd o həzrətin (s) şəxsən özünə yox, onun duasına təvəssül .etməkdir

Burada iki zəruri nöqtə var: biri Rəsulullahla (s) kor şəxs arasındakı danışıq, digəri Rəsulullahın (s) ona öyrətdiyi dua. Burada dəlil göstərilən Rəsulullahla (s) kor şəxs arasındakı söhbət deyil. Çünki bu danışıqda həmin şəxs Rəsulullahdan (s) istəyir, Peyğəmbər (s) də razılaşıb ona dua edir. Dəlil bu söhbət yox, Peyğəmbərin (s) kor .şəxsə dua etməyi öyrətməsidir

Dəlil və əsaslandığımız ikinci nöqtə Peyğəmbərin (s) o şəxsə öyrətdiyi duadır. Adı çəkilən duadan göründüyü kimi təvəssül həzrətin (s) duasına deyil, şəxsən onun .özünədir

Bu səhih hədis Peyğəmbərə (s) həyatda olduğu vaxt təvəssül etməyin caiz və .müstəhəb olduğunu göstərir

:İkinci hədis

Təbərani "Cami Kəbir"də, Hakim "Mustədrək"də, Beyhəqi "Dəlailun-nubuvvət"də və İbn Həyyan Rəsulullahdan (s) nəql edirlər: Əmirəl-möminin Əlinin (ə) anası Fatimə binti :Əsəd vəfat edəndə onun dəfni üçün qəbir hazırlandı. Rəsulullah (s) buyurdu

الله الذی یحیی و یمیت و هو حی لا یموت اغفر لأمی فاطمه بنت اسد و وسع علیها مدخلها بحق نبیک و الأنبیاء الذین من قبلی

Allah dirildən və öldürən, diri və ölməzdir. Peyğəmbərinin (s) və məndən öncəki"

(mənzilini) genişləndir." (١)

Seyid Əhməd Zəyni Dəhlan "Əd-Durərus-Sunniyyə firrəddi ələl-vəhhabiyyə" kitabında yazır: "Bu hədisi İbn Əbi Şeybə Cabirdən, İbn Əbdül-Birr İbn Abbas və Əbu Nəimdən nəql etmişdir." (٢)

Bu dua həm dirilərə, həm də ölülərə təvəssülün səhihliyini göstərir. Burada diri şəxsə təvəssül Peyğəmbərlə (s), ölülərin haqqına təvəssül qabaqkı peyğəmbərlərlə bağlıdır.

Xülasətul-kəlam" kitabında deyilir: "Bu hədisi Təbərani ("Cami Kəbir" və "Ovsət"də)," İbn Həyyan və Hakim nəql etmiş və səhih hədis saymışlar." (٣)

Üçüncü hədis:

Əbdül-Məlik ibn Harun ibn Əntərədən, o atasından, atası da cəddindən rəvayət edir ki, Əbu Bəkr Peyğəmbərin (s) yanına gəldi və dedi: "Mən Quran öyrənirəm. Amma bəzən onu unuduram." Peyğəmbər (s) buyurdu ki, belə de:

اللهم انی أسألک بمحمد نبیک و ابراهیم خلیلک و بموسی نجیک و عیسی روحک و بتوراه موسی و انجیل عیسی و فرقان محمد و بکل وحی اوحیته و قضاء قضیته

Pərvərdigara! Səndən istəyirəm peyğəmbərin Məhəmməd xatirinə, Sənin dostun" İbrahim xatirinə, Sənin həmsöhbətin Musa xatirinə, Sənin ruhun İsan xatirinə, Musanın Tövratı, İsanın İncili, Məhəmmədin Furqanı xatirinə, göndərdiyin hər bir vəhyə xatir, ötüb keçən hər bir hadisəyə xatir... "

İbn Teymiyyə deyir: "Bu hədisi İbnus-Sunni və Əbu Nəim - gecə və gündüzün əməlləri barədə kitab yazanlar rəvayət etmişdir. Bunu Əbul-Şeyx İsfahani "Fəzailul-Əmal" kitabında, Zərrin ibn Muaviyə öz "Cami"sində və İbn Əsir "Camiul-



---

١- [١] . "Kəşful-İrtiyab", səh. ٢۶۵; "Vəfaul-Vəfa", ۴-cü cild, səh. ١٣٧٣.

٢- [٢] . "Ayini vəhhabiyyət", səh. ١۵٩, Cəfər Sübhani; Vəfaul-Vəfa, ۴-ci cild, səh. ١٣٧٣.

٣- [٣] . "Ayini vəhhabiyyət"", səh. ١۵٩.

Üsul"da qeyd etmişdir. Bu iki nəfər onun nəqlində müsəlman kitablarından birinə də (istinad etməmişlər. " (١)

:Dördüncü hədis

Təfsir sahibi Musa ibn Əbdürrəhman Sənani öz sənədi ilə İbn Abbasdan nəql edir: Hər kəs Quranın onun zehnində qərar verməsini və onu əzbər bilənlərdən olmasını istəsə, :bu duanı yazsın

اللهم انی أسألک بأنک مسئول لم یسأل مثلک و لا یسأل و أسألک بمحمد نبیک و ابراهیم خلیلک و بموسی نجیک و عیسی روحک و کلمتک و وجهک(٢)

Bu hədisdə qabakı hədisdə olduğu kimi Allah Məhəmmədin, İbrahimin, Musanın və .İsanın adıyla çağırılır

:Beşinci hədis

Səid ibn Cubeyr İbn Abbasdan rəvayət edir ki, Xəbir yəhudiləri Ğətfan tayfası ilə :döyüşər, hər dəfə də məğlub olub qaçardılar. Axırda onlar bu duaya pənah apardılar

اللهم انا نسألک بحق محمد النبی الأمی الذی وعدتنا ان تخرجه لنا فی اخر الزمان الا نصرتنا علیهم

Pərvərdigara! Ümmi peyğəmbər Məhəmmədin (s) haqqına - bizim üçün axirəz-" zamanda onu göndərməyinə vədə vermisən - Səndən istəyirikki, onlara qalib gəlmək ".üçün bizə kömək edəsən

Onlar nə vaxt bu duanı oxuyurdularsa, Ğətfan tayfası meydandan qaçırdı. Peyğəmbər :(s) məbus olandan sonra isə onu inkar etdilər və Allah-taaladan bu ayə nazil oldu

... و کانوا من قبل یستفتحون ...

Halbuki əvvəlcə (Məhəmməddən qabaq) kafirlərə qələbə çalmaq üçün Allaha" (yalvarırdılar." (٣)

(Bu hədis də yəhud qövminin İslam peyğəməbərinə (s

.Ət-Təvəssulu ila Həqiqətil-təvəssul", səh. ٣١٠, Şeyx Nəsib" . [١] -١

.Həmin mənbə; "Ət-Təvəssulu vəl-vəsilə", səh. ١١٠, Hafiz ibn Teymiyyə . [٢] -٢

.Bəqərə" surəsi, ayə ٨٩; Hakim, "Mustədrək", ٢-ci cild, səh. ٢٦٣" . [٣] -٣

.təvəssül etməsini göstərir

:Altıncı hədis

Nəql olunmuşdur ki, Əbdül-Mütəllib Peyğəmbər (s) vasitəsilə Allahdan yağış istədi. Həmin vaxt Peyğəmbər (s) kiçik bir uşaq idi. Əbu Talib Peyğəmbər (s) barədə :buyurmuşdur

و ابيض يستسقى الغمام بوجهه

ثمال اليتامى عصمه للأرامل

Ağ çöhrəli birinin siması vasitəsilə buludlardan yağaş istənilər. O yetimlərin sığınacağı" ".və kimsəsiz qadınların yardımçısıdır

Burada Əbdül-Mütəllibin Peyğəmbər (s) vasitəsilə yağış tələb etməsinə işarə olunmuşdur.(١) Əbu Talib də Məkkədə qıtlıq ilində Peyğəmbər (s) vasitəsilə Allahdan yağış istədi. İbn Əsakir İbn Ərfələdən nəql edir ki, mən Məkkəyə daxil oldum. Həmin il Qüreyş qıtlıqdan əziyyət çəkir və Əbi Talibə deyirdilər: "Ey Əbu Talib! Qıtlıq Məkkə ".vadisini bürüyüb və camaat yoxsulluq içindədirlər. Gəl Allahdan yağış istə

Əbu Talib çölə çıxdı. Yanında üzü günəş kimi parlayan bir oğlan da vardı. O, peyğəmbər idi. Əbu Talib onun arxasını Kəbəyə söykədi və barmağı ilə cavana işarə edib dua oxudu. Səmada bulud olmadığı halda yağış yağmağa başladı. Bu barədə Əbu :Talib öz qəsidəsində deyir

و ابيض يستسقى الغمام بوجهه. . .(٢)

Peyğəmbər (s) vasitəsilə yağış tələb etmək (o, Əbdül-Mütəllibin zamanında kiçik bir uşaq, Əbu Talibin dövründə gənc bir oğlan idi) məşhur əhvalatlardandır. Bu əhvalat Peyğəmbərin (s) zamanında da yada salınardı. Rəsulullahın (s) zamanında o həzrətin (s) duası ilə yağış yağanda, həzrət (s) buyurdu: "Əgər Əbu Talib sağ qalsaydı, onun ".gözləri aydınlaşardı

".Əli (ə) ayağa qalxdı və ərz etdi: "Deyəsən sizin məqsədiniz Əbu Talibin şeridir

.Sonra o qəsidədən bir neçə beyt oxudu

Bu söhbətdən aydın olur ki, o həzrətə (s) uşaqlıq və cavanlıq dövründə öz razılığı ilə .təvəssül edilirmiş

:Yeddinici hədis

Buxari "Səhih" kitabında, İbn Əsir "Usdul-ğabə fi mərifətis-səhabə" kitabında yazır: "Qıtlıq illəri olanda Ömər ibn Xəttab Abbas ibn Əbdül-Mütəllib vasitəsilə yağış tələb edib deyərdi: "Pərvərdigara! Biz keçmişdə Sənə peyğəmbərlərin vasitəsilə təvəssül edib sirab olardıq. İndi isə peyğəmbərimizin əmisi vasitəsilə Sənə təvəssül edirik. Bizi sirab et!" Sonra Allah onları sirab edərdi." (١)

Bu tarixi hadisədən aydın olur ki, Peyğəmbərin (s) Allah yanında vasitə qərar verilməsi dəfələrlə baş vermişdir. Burada "كنا نتوسل" (təvəssül edərdik) sözü bu işin davamlı olduğunu göstərir. Peyğəmbərin (s) əmisi Abbasa təvəssül də təvəssülün caizliyinə sübutdur. Bu duanın zahiri belə görünür ki, xəlifə özü duasından sonra yağış yağarmış. :O deyir

هذا والله الوسيله الى الله

".And olsun Allaha! O, Allah dərgahında vasitədir"

Qəstəlani yazır: "Ömər Abbas vasitəsilə yağış tələb edəndə dedi: "Ey camaat! Rəsulullah (s) Abbasa ata gözü ilə baxardı. Ona itaət edin. Onu özünüz üçün vasitə ".qərar verin

Burada təvəssülə də işarə olunmuşdur. Hədis təvəssülü haram hesab edənlərin, onun yalnız Peyğəmbərə (s) məxsus olduğunu deyənlərin iddiasını batil edir. Halbuki burada Peyğəmbərdən (s) qeyrisinə təvəssül olunmuşdur."(٢)

Abbasa təvəssül etmək bir növ Peyğəmbərə (s) təvəssül etməkdir. Çünki Ömər öz ".duasında deyir: "Biz Peyğəmbərin (s) əmisinə təvəssül edirik

Yəni Peyğəmbərə (s) yaxınlığı vasitəsilə Allah yanında məqam və hörməti olan şəxsə təvəssül edilir. Bəli, Abbasın özünə görə yox, o Peyğəmbərin (s) əmisi olduğu üçün ona

.təvəssül edilir

səh:۱۰۴

---

.Səhih i -Buxari", ۲-ci cild, səh. ۳۴, Babul-İstisqa" . [۱] -۱

.Əl-Məvahibul-ləduniyyətu", ۳-cü cild, səh. ۳۸۰" . [۲] -۲

Fəthul-Bari fi şərhi hədisil-Buxari" kitabında İbn Həcər Əsqəlani nəql edir ki, Abbas" :yağış üçün duasında belə ərz etdi

و قد توجه القوم بی الیک لمکانی من تبیک

Camaat Sənin peyğəmbərinə yaxınlığım və qohumluğuma xatir mənim vasitəmlə" ".Sənə təvəssül edir

Səmhudi deyir: "İbn Noman "Misbahuz-Zəlam" kitabında Ömərin Rəsulullahın (s) əmisi Abbası vasitə qərar verməklə yağış istəməsi dastanını nəql etmişdir. Hafiz Əbul-Qasim Hibətullah ibn əl-Həsən bu hadisəni müxtəlif vasitələrlə nəql edir. Onların bəziləri Ənəs ibn Malikdən (rəziyəllahu ənh) nəql olunur. O deyir: "Qıtlıq olanda Ömər ibn Xəttab Abbas ibn Əbdül-Mütəllib vasitəsilə yağış istəyib dedi: Pərvərdigara! Keçmişdə qıtlıq olanda Sənə Peyğəmbərimiz (s) vasitəsilə təvəssül edər və sirab olardıq. İndi isə Sənə "!Peyğəmbərimizin (s) əmisi vasitəsilə təvəssül edirik. Bizi sirab et

".Ənəs deyir: "Sonra Allah onları sirab edərdi

Başqa bir rəvayətdə İbn Abbasdan nəql olunmuşdur ki, Ömər ərz etdi: "Pərvərdigara! Biz Peyğəmbərin (s) əmisi vasitəsilə Səndən su istəyirik. Onun ağ saçları ehtiramına ".Səndən şəfaət diləyirik

:Sonra onlar sirab olardılar. Bu barədə Abbas ibn Ütbə ibn Əbi Ləhəb bir şerdə deyir

Allah Hicaz və onun əhlini əmim (Abbasın) vasitəsilə sirab etdi. O gecə Ömər onun ağ" ".saçları və qocalığı ehtiramına Allahdan yağış istədi

Nəql olunmuşdur ki, Abbas (rəziyəllahu ənh) öz duasında Allaha ərz etdi: "Pərvərdigara! Mənim Peyğəmbərlə (s) yaxınlığıma görə bu qövm məni vasitə qərar ".verib, sənə üz tutub

İbn Əsir Cəzri "Usdul-ğabə fi mərifətis-səhabə" kitabında deyir: "Ömər ibn Xəttab "Ammur-rimadə"də (torpağın susuzluqdan yanıb və kül kimi olduğu ildə) şiddətli qıtlıq olanda Abbas (rəziyəllahu ənh) vasitəsilə yağış istədi və Allah Abbasın ehtiramına xatir ".onları sirab etdi, torpaq bol məhsul verdi

Hisan ibn Sabit bir şerdə belə demişdir: "Qıtlıq bizə qələbə çalanda imam (Ömər) Allahdan kömək istədi. Bu zaman buludlardan həzrətin (s) varisi olan əmisi Abbasın .izzət və ehtiramına xatir yağış yağdı

Allah Abbasın ehtiramına bütün torpaqları diriltdi, ümidsizlikdən sonra hər tərəf .yaşıllığa büründü

Camaat sirab olandan sonra sevinc və şadlıqla Abbası öyüb deyirdi: "İki hərəm saqisi (olmağın mübarək!" (١

(İbn Teymiyyə "Ziyarətul-qubur" risaləsində bu rəvayətin səhihliyini qeyd edir.(٢

**ğ) Vəfatından sonra Peyğəmbərə (s) təvəssül**

Burada təvəssülün şəriət tərəfindən caiz sayılmasında əsas götürülmüş rəvayətlərə :işarə olunacaq

Səmhudi "Cami Kəbir" kitabında Təbəranidən, o da Osman ibn Huneyfdən nəql edir-١ ki, bir kişi Osman ibn Əffvanın (üçüncü xəlifənin) yanına bir istəklə get-gəl edirdi. Ancaq xəlifə onun istəyinə məhəl qoymurdu. O Osman ibn Huneyflə görüşüb ona şikayətləndi. Osman ibn Huneyf ona dedi: "Get dəstəmaz al, məsciddə iki rəkət namaz :qıl və de

Pərvərdigara! Mən Sənə rəhmət peyğəmbərin Məhəmməd (s) vasitəsilə üz tuturam." Ey Məhəmməd! Həqiqətən, mən istəyimin yerinə yetməsi üçün sənin vasitənlə ".Allahına üz tutmuşam

".Daha sonra öz istəyini yada sal

Həmin şəxs deyildiyi kimi etdi. Sonra Osmanın (üçüncü xəlifənin) evinə getdi. Qapını açan şəxs onun əlindən tutub xəlifənin yanına apardı. Osman onun istəyini soruşdu. O "!öz istəyini dedi. Xəlifə onun istəyini yerinə yetirib dedi: "Nə vaxt bir istəyin olsa, de



---

.Usdul-ğabə", ٣-cü cild, səh. ١١١" .[١]-١

Sonra o, Osmanın yanından çıxıb, İbn Huneyflə görüşdü və dedi: "Allah sənə xeyir ".versin. Əgər sən ona bir söz deməsəydin, xəlifə mənim istəyimə diqqət yetirməzdi

İbn Huneyf cavabında dedi: "And olsun Allaha! Mən ona bu barədə heç bir söz deməmişəm. Ancaq şahidəm ki, kor bir kişi Rəsulullahın (s) yanına gəlib, öz korluğundan şikayətləndi. Peyğəmbər (s) ona dedi: "Əgər istəsən dua edərəm. Ya da ."səbr et

O dedi: "Ey Rəsulullah! Mənim əlimdən tutan adamım yoxdur. Bu korluq mənim üçün ".çox çətindir

"!Rəsulullah (s) ona buyurdu: "Get dəstəmaz al, iki rəkət namaz qıl və belə dua et

İbn Huneyf deyir: "And olsun Allaha! Biz bir-birimizdən ayrılmamış və söhbətimiz ".qurtarmamış o kişi yanımıza qayıtdı . Elə bil heç vaxt kor olmamışdı

(Səmhudi deyir: "Həmin bu əhvalatı Beyhəqi də iki vasitə ilə nəql etmişdir." (١) (٢

Bu əhvalat Rəsulullaha (s) həm vəfatından sonra, həm də həyatı dövründə təvəssülün .caizliyini göstərən növbəti sənəddir

Rəsulullaha (s) həyatı zamanında təvəssülə aid iki hədisdə qeyd olundu ki,-٢ :Peyğəmbər (s) Fatimə binti Əsəd üçün duasında buyurdu

و وسع عليها مدخلها بحق نبيك و الانبياء الذين من قبلى

Peyğəmbərinin və məndən qabaqkı peyğəmbərlərin haqqına, onun daxil olduğu yeri" (genişləndir." (٣



---

.Vəfaul-vəfa", ۴-cü cild, səh. ١٣٧٣" . [١] -١
Təbərani, "Əl-Mucəmul-kəbir", ٩-cu cild, səh. ٣٠, "Babu ma usnidə ila Usman ibn . [٢] -٢ .Hunəyf", rəqəm ٨٣١١
.Kəşful-irtiyab", səh. ٢۶۵; "Vəfaul-vəfa", ۴-cü cild, səh. ١٣٧٣" . [٣] -٣

Bu duada Peyğəmbər (s) keçmiş peyğəmbərlərin haqqına and verib, Allahdan istəyir və şübhəsiz, bu ölmüş insanlara təvəssülün bir nümunəsidir. Yəni o Allahı özündən .qabaqkı bütün peyğəmbərlərin haqqına and verir

Peyğəmbər (s) həyatda olduğu zaman ona təvəssülə aid hədislərdən üçüncüsündə,-٣ həmçinin Əbu Bəkrə təlim etdiyi duada, Allah Məhəmməd, İbrahim, Musa və İsa vasitəsilə çağırılır. Onların hər üçü dünyasını dəyişmişdir. Bu rəvayətə əsasən, Allahı peyğəmbərlərin vəfatından sonra onların haqqına and verib çağırmaq və onlara (təvəssül caizdir.(١

:Dördüncü rəvayətdə İbn Abbasın Quranı əzbərləmək üçün öyrətdiyi duada deyilir-۴

و أسألك بمحمد نبيك و ابراهيم خليلك و بموسى نجيك و عيسى روحك و كليمك(٢)

Bu duada da Allaha İbrahim, Musa və İsaya təvəssül vasitəsilə müraciət edilir. Dua .təlim edildiyi zaman bu insanlar dünyalarını dəyişmişdilər

Səmhudi nəql edir ki, Mədinədə şiddətli qıtlıq baş verdi. Camaat Aişəyə-۵ şikayətlənirdi. Aişə dedi: "Peyğəmbərin (s) qəbrinə nəzər salın və oradan səmaya tərəf ".bir baca açın. Belə ki, qəbirlə səma arasında divar olmasın

Bu göstərişə əməl olundu. Sonra elə bir yağış yağdı ki, otlar göyərdi, dəvələr cana gəldi. Bu əməl Mədinə əhli üçün ənənə oldu və quraqlıq olanda göylə Peyğəmbərin (s) qəbri arasında baca açardılar.(٣) Bu, Peyğəmbərin (s) vəfatından sonra onun qəbrinə təvəssülün bir növüdür. "Vəfaul-vəfa"da yazılır: "Mədinə camaatının adət-ənənəsi bu idi ki, hərəmdə həzrətin (s) mübarək üzü müqabilində olan qapını açar, oraya ".toplaşardılar



---

.Ət-təvəssulu ila həqiqətil-təvəssul", səh. ٣١٠" .[١]-١

.Həmin mənbə .[٢]-٢

.Vəfaul-vəfa", ۴-cü cild, səh. ١٣٧۴" .[٣]-٣

.Qeyd etmək lazımdır ki, bu ənənə Səmhudinin zamanına aid idi

Qəstəlani nəql edir: "Səhrada yaşayan ərəblərdən biri Peyğəmbərin (s) qəbri-۶ yanında dayandı və dedi: "Pərvərdigara! Qulların azad olunmasını əmr etdin. Bu (Peyğəmbərin (s) qəbrinə işarə edib) Sənin dostun və həbibindir, mən də Sənin bəndənəm. Səni and verirəm bu qəbir sahibinin haqqına, məni oddan azad et." Bu zaman bir şəxs onu nida etdi: "Ey kişi! Azadlığı nə üçün bütün möminlər üçün yox, "!yalnız özün üçün istədin? Get, səni azad etdim

:Sonra Qəstəlani məşhur iki beytdə deyir

ان الملوک اذا شابت عبيدهم

فی رقهم اعتقوهم عتق احرار

و انت يا سيدی أولی بذاکرما

قد شبت فی الرق فاعتقنی من النار(۱)

.Padşahlar qulları öz cavanlıqlarını qulluqda keçirib qocalanda azad edirlər"

Sən ey mənim ağam və böyüyüm! Kəramətli olduğun üçün bu işə daha layiqlisən. ".Həqiqətən, mən qulluqda qocalmışam, məni oddan azad et

Həmçinin Həsən Bəsridən nəql edir: "Hatəm Əsəm Peyğəmbərin (s) qəbri yanında-۷ dayanıb dedi: "Ey Pərvərdigarım! Sənin peyğəmbərinin qəbrini ziyarət etdik. Bizi öz "!dərgahından əliboş qaytarma

Ona nida yetişdi: "Ey kişi! Biz səni qəbul etməmiş öz dostumuzun qəbrinin ziyarətinə ".izn verməyik. Sən və səninlə ziyarət edən hər şəxs bağışlanmış halda qayıtsın

Bu iki dastan Rəsulullahın (s) vəfatından sonra ona təvəssül etmək barədədir. Əlbəttə, hər iki əhvalat ilahi əzabdan azad olmağa və Allah dərgahında məhrum qalmamağa ,aiddir. Bu, təvəssülün ikinci növündən

Allaha xitab və ondan istək barədədir. Burada həm də Peyğəmbər (s) vasitə qərar verilmişdir. Amma Peyğəmbərin (s) şəxsən özündən istənilmədiyi üçün birinci növ .təvəssül hesab olunmur

Xülasətul-kəlam" kitabında "Cəvahirul-kəlam"dan nəql olunmuşdur ki, səhrada"-٨ yaşayan bir ərəb Peyğəmbərin (s) qəbri kənarında dayandı və dedi: "Pərvərdigara! Bu Sənin dostun, mən Sənin bəndənəm. Şeytan isə Sənin düşmənindir. Əgər məni bağışlasan, dostun sevinər, bəndən nicat tapar və düşmənin qəzəblənər. Əgər məni bağışlamasan, dostun qəmlənər, düşmənin sevinər və bəndən də həlak olar. Ey mənim Pərvərdigarım! Sən öz dostunu qəmləndirməyən, düşmənini sevindirməyən və bəndəni həlak etməyən kəramət sahibisən. Pərvərdigara! Əgər ərəblər arasında böyük bir şəxs və ağa ölərsə, onlar onun qəbrinə xatir qul azad edərlər. Həqiqətən, bu (Rəsulullahın (s) qəbrinə işarə edir) bütün aləmin böyüyüdür. Ey rəhm edənlərin rəhm "!edəni! Məni onun qəbrinə xatir azad et

Onun sözünü eşidənlər dedilər: "Ey ərəb qardaş! Allah səni bu yaxşı istək və tələbin (vasitəsilə bağışladı və əfv etdi." (١

Məhəmməd ibn Übeydullah ibn Əmr Ətbadan nəql olunmuşdur ki, o dedi:-٩ :Peyğəmbərin (s) qəbri yanında oturmuşdum. Səhrada yaşayan bir ərəb gəldi və dedi

السلام علیک یا رسول الله!

"!Əssəlamu ələykə ya Rəsulələllah"

Başqa bir rəvayətdə isə belə dediyi nəql olunur: "Salam olsun sənə, ey peyğəmbərlərin ən yaxşısı! Həqiqətən, Allah sənə doğru və düz danışan bir kitab nazil etmişdir. O kitabda buyurmuşdur: "Onlar özlərinə zülm etdikləri zaman sənin yanına gəlib Allahdan bağışlanma



---

.Kəşful-irtiyab", səh. ٢٥٨" . [١]-١

diləyərdilər və Rəsulullah (s) onlar üçün bağışlanma tələb edərdi. Onlar Allahın bağışlayan və tövbələri qəbul edən olduğunu görərdilər." - Mən də sənin yanına öz ".günahımın bağışlanmasını istəyən halda gəlmişəm

Sonra ərəb bağışlanma istəyib qayıtdı. Mənim gözlərimi yuxu apardı. Yuxuda Peyğəmbəri (s) gördüm. O həzrət (s) buyurdu: "Ey Ətba! O ərəbin dalınca get və müjdə ".ver ki, Allah sənin günahlarını bağışladi

".Mən onun dalınca getdim, amma tapa bilmədim

(Bu əhvalatı Səmhudi "Vəfaul-vəfa"da qeyd etmişdir.(١

Əhvalatda Allaha xitab olunmuşdur, Peyğəmbər (s) bağışlanmaq üçün vasitə qərar .verilmişdir

Vəfaul-vəfa" kitabında deyilir: "Bu hekayə məşhur bir hekayədir. Onu bütün" məzhəblərin həcc əməllərindən yazan yazıçıları nəql etmiş, düzgün bilmiş və ziyarət qaydalarından saymışlar. İbn Əsakir öz tarixində, İbn Cuzi "Muşirul-ğuram"da onu nəql etmişlər. Başqaları da Məhəmməd ibn Hərb Hilalidən bir neçə sənədlə bu əhvalatı (qeyd etmişlər." (٢

Peyğəmbərə (s) vəfatından sonra təvəssül nümunələrindən biri də Əbdül-Mütəllibin-١٠ qızı, Peyğəmbərin (s) bibisi Səfiyyənin həzrətin (s) vəfatında söylədiyi şerləridir. Bu iki :beyt həmin şerlərdəndir

الا يا رسول الله (ص)! كنت رجائنا

و كنت بنا برا و لم تک جافيا

و کان بنا برا رحيما نبينا

لبيک عليک اليوم من کان باکيا

Ey əziz Peyğəmbər! Sən bizim ümidimizsən. Sən bizə zülmkar yox, xeyirxah oldun." Sən bizə mehriban idin. Ey bizim Peyğəmbərimiz! Bu gündən kim ağlasa gərək sənə ".ağlasın

Kuntu rəcaəna" (Bizim ümidimizsən)" "كنت رجائنا". Peyğəmbərə (s) xitab olunmuşdur cümləsi Peyğəmbərin (s) ölümündən sonra müsəlmanların Peyğəmbərə təvəssülə, ondan yardım almağa ümidli olduğunu göstərir. Yəni sən şəfaətdə, təvəssüldə bizim ümidimizsən; sən Allah dərgahında bizim üçün vasitəsən... Peyğəmbərin (s) ölümündən sonra ümid yeri olması təvəssüllə əlaqəlidir.(١)

١١- Beyhəqi və İbn Əbi Şeybə rəvayət edirlər: "Ömərin xilafəti zamanında qıtlıq oldu. Bilal ibn Hərs (Peyğəmbər (s) səhabələrindan idi) Peyğəmbərin (s) qəbrinə tərəf gedib dedi:" Ey Allahın Rəsulu! Ümmət həlak olur, onlar üçün su (yağış) tələb et".

Sonra Bilal Rəsulullahı (s) yuxuda gördü. Ona müjdə verildi ki, tezliklə camaat sirab olacaq." (٢)

Bu dastanda Bilal vəfatından sonra Peyğəmbərə (s) xitab və təvəssül edir, ondan yağış və ümmətin sirab olmasını istəyir. Əgər bu iş bidət, haram olsaydı, heç vaxt Rəsulullahın (s) səhabələrindən biri o birilərinin hüzurunda belə bir addım atmazdı.

Bu rəvayəti nəql edən Zəyni Dəhlan deyir: "Hər kəs keçmişdəkilərin dualarına və zikrlərinə diqqət yetirsə təvəssülə aid çox nöqtələr tapar. Həmin insanlara heç vaxt irad tutulmamışdır." (٣)

Səmhudi bu rəvayəti Beyhəqidən, Beyhəqi Əbi Salehdən, o da Malikud-Dardan nəql edir və deyir: "İbn Əbi Şeybə də səhih sənədlə onu Malikud-Dardan nəql etmişdir".

Sonra deyir: "(Qeyd olunmuş rəvayətdə) Məqsəd



---

١- [١]. "Məcməuz-zəvaid", ٩-cu cild, səh. ٣٩; " Ayini -vəhhabiyyət", səh. ١٧٢ və ١٧٣-də "Zəxairul-uqba fi mənaqibi zəvil-qurba"da səh. ٢٥٢-dən nəql olunub.

٢- [٢]. Zəyni Dəhlan, "Əddurərul-Sunniyyə", ١-ci cild, səh. ٩.

٣- [٣]. "Əddurərul-Sunniyyə", ١-ci cild, səh. ٣١.

Peyğəmbərdən (s) su tələb etməkdir. Bir haldakı o həzrət (s) bərzəxdədir və ondan bir şey istəmək eyb sayılmır. Digər tərəfdən həzrətin (s) bu istəkdən xəbərdar olduğu rəvayətdə nəql edilmişdir. Deməк, Peyğəmbərdən (s) su və başqa şeylər istəməyin (eybi yoxdur. Necə ki, bu iş dünya həyatında eyb sayılmır." (۱)

Xülasətul-Kəlam" kitabında "Məvahibul-lədunniyyə"dən nəql edilir: "Tabeinin"-۱۲ (səhabəyə tabe olanların) ardıcıllarından, məşhur və etibarlı böyük şəxslərdən sayılan İbn Fədyəkdən iki "Səhih"də rəvayət olunmuşdur ki, alimlərdən və saleh bəndələrin bəziləri deyir: "Bizə belə çatıbdır ki, hər şəxs Peyğəmbərin (s) qəbri yanında dayanıb "Ya əyyuhəlləzinə amənu" ayəsini oxusa və yetmiş dəfə "Səlləllahu ələykə ya Muhəmməd!" desə, onu bir mələk çağırar (salam olsun sənə ey filanşəxs!) və heç bir .istəyi cavabsız qalmaz

".İbn Fədyəkin "Məvahib"də nəql etdiyi bu rəvayəti Beyhəqi də nəql edir

Bu, Peyğəmbərin (s) vəfatından sonra ona təvəssül, ondan kömək istəyinin caiz olduğunu göstərir. Bu həm də ölümündən sonra həzrətə xitabdır və onunla əlaqə .olduğunu göstərir

Xülasətul-Kəlam" kitabında deyilir: "Alimlərin Rəsulullahın (s) ziyarət qaydası"-۱۳ barədə dedikləri əməllər belədir: Müstəhəbdir ki, ziyarətçi bu məkanda tövbəni təzələsin, onun qəbul olunması üçün Rəsulullahın (s) vasitəsi ilə şəfaət tələb etsin ( tövbəsinin qəbul olunması üçün Rəsulullahı (s) şəfaətçi və vasitə qərar versin), çoxlu :bağışlanma diləsin, sonra bu ayəni tilavət etsin

و لو انهم اذ ظلموا أنفسهم جاؤك . . .(۲)

!Allah dərgahında sızıldayıb desin: "Ey Allahın Rəsulu



---

.Vəfaul-Vəfa", ۴-cü cild, səh. ۱۳۷۳" . [۱]-۱

.Nisa" surəsi, ayə ۶۴" . [۲]-۲

Biz sənin ziyarətçilərin və qonaqlarınıq! Sənin hüzuruna haqqını əda etmək və ziyarətinə nail olmaq üçün gəlmişik. Çiynimizdəki günahların ağırlığına görə səndən şəfaət tələb edirik. Ey Allahın Rəsulu! Şəfaət üçün səndən başqasına ümidimiz yoxdur. Sənin dərgahından başqa bir dərgaha ümidimiz və əlimiz çatmır. Bizim üçün bağışlanma dilə, Pərvərdigarın yanında bizə şəfaət et və Allahdan istə ki, digər istəklərimizi qəbul etməklə bizə minnət qoysun." (١)

Bu duanın məzmunu Peyğəmbərin (s) vəfatından sonra ona təvəssülün, hər hansı istəyin caiz olduğunu göstərir. Bu nəqlə əsasən, alimlər onun müstəhəbliyini qəbul etmişlər.

### d) Mələklərə təvəssül

Xülasətul-Kəlam"da "Əzkar" kitabından, Novidən nəql olunub: Peyğəmbər (s) əmr" etdi ki, iki rəkət sübh namazından sonra üç dəfə deyilsin:

اللهم رب جبرئيل و ميكائيل و اسرافيل و محمد؛ أجرني من النار

Ey Cəbrayılın, Mikayılın, İsrafilin və Məhəmmədin (s) Pərvərdigarı! Mənə oddan nicat" ver."

Qeyd olunmuş kitabın şərhində Novi deyir: "Duanın qəbulu üçün onlara təvəssül olaraq adlar sadalanır. Hərçənd O bütün məxluqların Pərvərdigarıdır." (٢)

Hakim bu hədisi səhih bilmiş, İbn Həcər də onu mötəbər hesab etmişdir.

### e) Saleh bəndələrə təvəssül

١-(s Əbu Səid Xidri Rəsulullahdan (s) nəql edir ki, o həzrət)



---

١-[١]. "Kəşful-İrtiyab", səh. ٢۵٨.

٢-[٢]. Zəyni Dəhlan, "Əd-Durərus-Sunniyyə", ١-ci cild, səh. ٣٠; "Ət-Təvəssulu ila Həqiqətit-Təvəssul", səh. ٣٠۶.

:buyurub: "Namaz qılmaq üçün öz evindən çıxan şəxs desin

اللهم انى أسألک بحق السائلين عليک و بحق ممشاى هذا. . .

". . . Əllahummə inni əsəlukə bi həqqis-sailinə ələykə və bi həqqi məmşayə haza"

(Bu barədə saleh əməllərə təvəssülə aid bəhsdə danışıldı.(١)

"بحق السائلين عليک" Həmin fəsildə deyildiyi kimi, bu dua da saleh bəndələrə təvəssüldür və bi həqqis-sailinə ələykə" cümləsi bunu göstərir. Çünki Allah dərgahından istəyənlər" Allahın saleh bəndələridir və bu duada da Allahı onların haqqına çağırırıq. Saleh əmələ təvəssül etmək bu duada da zikr olunmuşdur. Burada Allah bəndələrinin haqqı dedikdə Allaha vacib və zati olan haqq nəzərdə tutulur. Əslində Allahın öhdəsində kimsənin haqqı yoxdur. Burada məqsəd Allahın onlara əta buyurduğu, onlar üçün təyin :etdiyi haqdır. Məsələn, möminlər barədə buyurulur

و كان حقا علينا نصر المؤمنين

.Bu Allahın öz saleh bəndələrinə əta etdiyi məqamdır

Ömər ibn Xəttab Peyğəmbərin (s) əmisi Abbasa təvəssül etmişdir. Ömər-٢ Peyğəmbərin (s) əmisi Abbasın vasitəsilə yağış tələb edən zaman dedi: "Ey camaat! Allahın Peyğəmbəri (s) Abbasa ata gözü ilə baxırdı. Ona iqtida və təvəssül edin, onu ".özünüz üçün vasitə qərar verin

.Bu ötən bəhslərdə işarə olunmuş saleh bəndələrə təvəssül movzusudur

İbn Teymiyyə "Ziyarətul-Qubur" risaləsində deyir: "İki səhih rəvayətdə nəql olunur ki, Ömər ibn Xəttab Abbas vasitəsilə yağış istədi. Sonra dua edib dedi: "İlahi! Hər zaman bizə quraqlıq üz versəydi, Peyğəmbərimizə (s) təvəssül edib sirab olardıq. İndi isə (Peyğəmbərimizin (s



---

.Sunəni İbn Macə", ١-ci cild, səh. ٢٥۶" . [١] -١

(əmisinə təvəssül edirik, bizi sirab et." (١)

## ALİMLƏRİN SÖZÜ VƏ ƏMƏLİ

İbn Həcərin "Əs-Səvaiqul-Muhriqə" kitabında nəql olunub ki, imam Şafei-١ :Peyğəmbər (s) Əhli-beytinə (ə) təvəssül edib və deyərdi

آل النبی ذریعتی

و هم الیه وسیلتی

أرجوهم اعطی غدا

بیدی الیمین صحیفتی

Ali-Peyğəmbər (s) (yəni Əhli-beyt) mənim Allah dərgahında vasitəm və (çətinlik" zamanı) dəstəyimdir. Ümidvaram ki, qiyamət günü mənim əməl namən sağ əlimə (verilsin." (٢)

Buna əsasən, Malikiyyə imamı Malik, Hənbəli, Hənəfi və Şafei alimləri Peyğəmbərin (s) .(vəfatından sonra o həzrətə (s) təvəssülün yaxşı bir əməl olmasına qaildirlər (inanırlar

Xülasətul-Kəlam"da deyilir: "Peyğəmbərin (s) vəfatından sonra o həzrətə (s)" təvəssülü hənbəlilər caiz bilir. Bunun səhihliyini göstərən hədislər vardır. Səbki "Şifaus-Suqam" kitabında təvəssülün müstəhəb olması barədə dörd məzhəbin nəzərini nəql (etmişdir." (٣)

Xülasətul-Kəlam" və "Durərus-Sunniyyə"də İbn Həcərdən "Xəyratul-Hisan"da Əbu"-٢ Hənifənin "Mənaqib"i barədə (iyirmi beşinci fəsil) nəql edilir: "İmam Şafei Bağdadda olduğu günlərdə imam Əbu Hənifəyə təvəssül edər, onun zirehi və qəbri yanına gəlib ziyarətdən sonra salam verərdi. Sonra istəyinin yerinə yetməsi üçün Əbu Hənifənin ".vasitəsi ilə Allaha təvəssül edərdi

Sonra deyir: "İmam Əhməd ibn Hənbəl imam Şafeiyə

۱- [۱]. "Ziyarətul-Qubur", səh. ۱۵۵, "Kəşful-İrtiyab"dan nəql olunub.

۲- [۲]. "Kəşful-İrtiyab", səh. ۲۵۷.

۳- [۳]. Həmin mənbə.

təvəssül etdi. Hətta onun oğlu Abdulla ibn imam Əhməd onun Şafeiyə təvəssülünə təəccüb edərdi. Atası ona demişdi: "Şafei camaat üçün günəş kimidir (sağlamlıq bədən ".(üçün faydalı olduğu kimi

Zəyni Dəhlan deyir: "Məğrib camaatının Allah-taalaya imam Maliki vasitəsilə-٣ təvəssül etdiyini və onu öz istəklərində vasitə qərar verdiyini İmam Şafeiyə (çatdıranda, o bu əməli pisləmədi." (١

Qəstəlani "Məvahibul-Lədunniyyə" kitabında deyir: "Peyğəmbəri (s) ziyarət edən-٤ şəxs yaxşı olardı ki, çoxlu dua etsin, sızıldasın, kömək tələb etsin, şəfaət istəsin və Peyğəmbərə (s) təvəssül etsin. Bu vaxt yaxşı olar ki, Allah lazımi şəxsi ona şəfaətçi ".qərar versin

İstiğasə (kömək istəmək) dada yetişəcək adamı çağırmaqdır. İstiğasənin (kömək tələb etmək) təvəssül və təşəffu, təvəccüh və təcəvvuh sözü ilə ifadə olunmasının fərqi yoxdur. Çünki hər iki sözün kökü "cah" və "vəcahət"dir. Mənası isə uca mərtəbə, uca məqamdır. Məqam sahibi vasitəsilə onun özündən də uca məqam sahibinə çatmaq .üçün təvəssül olunur

Peyğəmbərə (s) istiğasə (kömək tələb etmək), təvəssül, təşəffu və təvəccüh ("Təhqiqun-Nusrət və Misbahuz-Zəlam" kitabında zikr olunduğu kimi) yetərli dəlillərə malik həqiqətdir. İstər yaranışından qabaq, istər dünyaya gələndən sonra, istərsə də bərzəxdə və qiyamətdə bu həqiqət öz gücündədir. Həzrətə (s) təvəssül və ondan (şəfaət istəyi uyğun mənbələrdə geniş şəkildə bəyan edilmişdir." (٢

Zərqani "Şərhul-Məvahib" kitabında deyir: "Əllamə Xəlilin qaydası belədir...-٥ Peyğəmbərə (s) təvəssül edilir və təvəssüldə o Həzrətin (s) məqamı ehtiramına Allahdan istənilir. Çünki Peyğəmbər (s) günah dağlarının nazil



---

.Həmin mənbə, səh. ٢٥٦ və ٢٥٧ . [١] -١

.Əl-Ğədir", ٥-ci cild, səh. ١٤٤" . [٢] -٢

olduğu yer və onların ağırlığıdır (burada məqsəd Həzrətin (s) ümmətə şəfaət istəməsidir) Onun Allah yanında əzəməti sayəsində heç bir günah qalmaz. Buna inanmayanın bəsirəti bağlanmış və o azdırılmışdır. Allah buyurmuşdur: "Onlar özlərinə (zülm etdikləri zaman dərhal sənin yanına gəlib Allahdan bağışlanma diləsəydilər..." (١)

Zərqani deyir: "Bəlkə Əllamə Xəlilin bu sözdə məqsədi İbn Teymiyyəyə tənə (vurmaqdır." (٢)

Əllamə Əmini deyir: "Əhli-sünnənin ziyalılarından və böyüklərindən bir dəstəsi-۶ təvəssül bəhsini genişləndirmiş və demişlər:" Hər bir halda Peyğəmbərə (s) təvəssül etmək caizdir. İstər yaradılmamışdan qabaq, istər dünyaya gələndən sonra, istər "!bərzəxdə və qiyamətdə

:Onlar Peyğəmbərə (s) təvəssülün üç növ olduğunu bildirirlər

Allah-taaladan Peyğəmbərə (s), onun məqamına, onun bərəkətinə xatir kömək-١ .istəmək. Deyirlər ki, bu mənada təvəssül bütün hallarda caizdir

.Dua istəyi ilə Peyğəmbərə (s) təvəssül. Bu da bütün hallarda caizdir-٢

Öz istəyini Peyğəmbərdən (s) tələb etmək. Bu mənada ki, Allahın yanında-٣ vasitəçiliklə məqsədimizi həyata keçirtməyə qadir olsun. Bu da iki növdür. Lakin bu iki növün mətnləri müxtəlifdir. Bir şəxsin Peyğəmbərdən (s) "Səndən cənnətdə səninlə .olmağı istəyirəm", sözünü bu növdən hesab etmişlər

Osman ibn Əbil-As deyir: "Quranı yaxşı öyrənə bilmədiyimə görə Peyğəmbərə (s) şikayətləndim. Həzrət (s) buyurdu: "Ey Osman! Yaxına gəl." Sonra Həzrət (s) mübarək əlini sinəmə qoydu və buyurdu: "Ey şeytan! Osmanın sinəsindən çıx." Ondan sonra hər ".nə eşitdimsə əzbərlədim

Səbki "Şifaus-Suqam" kitabında deyir: "Bu barədə



---

.Nisa" surəsi, ayə ۶۴" .[١]-١

rəvayətlər və hədislər çoxdur. Kömək istəyinin təvəssül, təşəffu (şəfaət tələb etmək), istiğasə (kömək diləmək), ya təcəvvuh və ya təvəccuh adlandırılmasının heç bir fərqi (yoxdur. Çünki bütün bunların mənası eynidir." (١

O yazır: "Dörd məzhəb alimlərinin həcc əməlləri və başqa mövzulardakı əsərlərində Peyğəmbərə (s) təvəssülün müqəddəsliyi barədəki bəhsləri üzərində dayanmaq imkanımız yoxdur. Onların hamısını zikr etmək istəsək, çoxcildli bir əsər olar. Bəziləri bu mövzuda ətraflı araşdırma aparmışlar. Hətta onların adlarını sadalamaq asan deyil. :O cümlədən

Hafiz ibn Cuzi (vəfatı ٥٩٧) "Əl-Vəfau fi fəzailil-Mustəfa" kitabında iki babı bu mövzuya-١ həsr etmişdir: Peyğəmbərə (s) təvəssül babı və Peyğəmbərin (s) qəbrindən şəfa .istəmək babı

Məhəmməd ibn Noman Malikin (vəfatı ٦٧٣) "Misbahuz-Zəlam fil-mustəğisinə bi-٢ xəyril-ənam" kitabı. Xalidi "Sulhul-İxvan" kitabında demişdir: "Misbahuz-Zəlam kitabı nəfis bir kitabdır. Onun iyirmi kitab qədərincə dəyəri var." Səmhudi "Vəfaul-Vəfa" .kitabında pak Peyğəmbərə (s) təvəssül babında bir çox rəvayətlər nəql edir

İbn Davud Maliki Şazili "Əl-Bəyan vəl-ihzar" kitabında alimlər və saleh bəndələr-٣ üçün çətinliklər yarandığı zaman onların Peyğəmbərin (s) qəbrinə sığınması və .nəticədə onlar üçün asanlıq yaranması barədə bir çox mətləblər zikr etmişdir

(Seyid Nuruddin Səmhudi (vəfatı ٩١١).(٢-٥

(Hafiz Əbul-As Qəstəlani (vəfatı ٩٢٣).(٣-٦

(Əbu Əbdillah Zərqani Misri Maliki (vəfatı ١١٢٢).(٤-٧

Xalidi Bağdadinin (vəfatı١٢٩٩) "Sulhul-İxvan" kitabı-٨



---

.Həmin mənbə . [١] -١

.Vəfaul-Vəfa", ٤-cü cild, səh. ١٣٧١ və ١٣٨٨" . [٢] -٢

۳- [۳] . "Şərhul-Məvahib", ۸-ci cild, səh. ۳۱۷.

۴- [۴] . Həmin mənbə.

bu mövzuda yazılmış ən dəyərli kitabdır. O, yetmiş səhifədə ixtilafları toplamış və təkcə Seyid Məhəmməd Alusinin Peyğəmbərə (s) təvəssülə münasibətini rədd edən bir risalə yazmışdır. Bu yazılar iyirmi səhifədə ١٣٠۶-cı ildə Nuxbətul-Əxbar .çapxanasında çap olunmuşdur

(Ədva Həmzavi (vəfatı ١٣٠٣).(١-٩

Əzzami Şafei Qəzainin "Furqanul-Quran" kitabı Beyhəqinin "Əl-Əsmau vəs--١٠ Səfəhat" kitabı ilə birlikdə ١۴٠ səhifədə çap olunmuşdur. Bu kitab hazırkı mövzuda (həqiqətləri çatdıran və dəlillərə əsaslanan bir kitabdır.(٢

Əlhəmdulillahi Rəbbil-aləmin



---

.Kənzul-Mətalib", səh. ١٩٨" .[١]-١
.Əl-Ğədir", ۵-ci cild, səh. ١۴۵ və ١۴۶" .[٢]-٢

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ٩

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ٢٠٠۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.١

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.٢ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .٣ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.١

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹